## TƏRCÜMƏÇİNİN ÖN SÖZÜ

Möhtərəm oxucu!

Hər bir kəs yazdığı, tərcümə və ya tərtib etdiyi əsərin* əslində olduğu kimi başa düşülməsi üçün kitabın mətnindən öncə verilən ön sözdə bir sıra yönəldici məsələləri izah etməyə çalışır. Bu, mən hesab edirəm ki, təbii istəkdir və həm də oxucunun əsərin məzmununu dərk etməsini asanlaşdırmaq məqsədi güdür (Digər məqsədlər də istisna edilmir.). Mən də buna görə, bir sıra əvvəlki tərcümələrimdə və redaktə etdiyim əsərlərdə tətbiq etdiyim kimi, Əhməd Əbdülhəlim əl-Hərraninin çevirdiyim bu əsərinə bəzi izahedici qeydlər yazmağa çalışacağam. Qeydlər, ilk növbədə tərcümənin daha anlaşıqlı olması məqsədilə edilir və reklam səciyyəsi daşımır. Digər tərəfdən, ön sözümüzdə bu əsərin vacib məsələlərindən olmasını qardaş və bacılarımızın nəzərinə çatdırmaqdır.

Öncə onu deyim ki, mətnin tərcüməsi zamanı müəllif fikrinin subyektiv üslub xüsusiyyətlərini saxlamaq və tərcüməni məzmun etibarilə mümkün qədər orijinala uyğun çevirmək məqsədi güdən tərcüməçi bir sıra üsullardan istifadə etmək imkanına malik olmalıdır. İlk növbədə bu imkanların zəruriliyi Qurana, Sünnəyə və saleh sələflərin əqidəsinə sadiq qalmaqdan və ikincisi isə, müəllifin özünəməxsus yazı üslubunun anlaşıqlığını təmin etmək istəyindən doğur. Çünki bəzi hallarda tərcümə olunan türk (ərəb və ya rus) mətnlərində, onların da orijinal olmadığını və çeviricilərin subyektiv üslublarını Azərbaycan dilində mütaliə edən oxucuya çatdırmaq üçün müəyyən əlavələrə, izah və şərhlərə, soraq formalı arayışlara sözsüz ki, ehtiyac duyulur.

Belə hallarda tərcüməçinin qarşısında bir-neçə çıxış yolu olur: mətndə müəllifin fikrini tamamlamaq, ona yönəldici, aydınlaşdırıcı əlavələr etmək. Bu, o qədər də arzu olunası üsul deyil və mən deyərdim ki, müəllif mətninə əl qatmaqdır. Bu gün gənc tərcüməçilərimizin təcrübəsində bu hal kifayət qədər geniş yer tutur. Halbuki, bu, çox vaxt müəllifin orijinal mətninə yolverilməz əlavələr etməklə bağlı olur. Çıxış yolunu, elmi ədəbiyyatda bundan əvvəllər də geniş tətbiq edilən sətiraltı izahlardan istifadə etməkdə görürəm. Məhz bu əsərdə də bir sıra sətiraltı qeydlərin olması oxucuların diqqətini cəlb edəcəkdir. Bəzi hallarda bu sətiraltı qeydlər zəruriyyətdən doğsa da, bəzən də, tərcüməçinin mətnə əlavələr etməsi müəllifin bu və ya başqa bir müddəasına öz münasibətini bildirmək, hər hansı bir ifadəni aydınlaşdırmaq istəyindən də irəli gələ bilir. Belə izahlar sətiraltı qeydlər kimi təbiidir və, bəlkə də, daha məqsədə uyğundur. Belə olduqda, müəllifin və ya özündən əvvəlki tərcüməçinin mətninə həmlə etmək ehtiyacı, demək olar ki, aradan qalxır və sair. Bax elə ilk ulduz işarəli sətiraltı qeydimizi götürək *(* Bu, xüsusilə, tərcümə olunmuş əsərlərə daha çox aiddir. F.S.).* Bu qeydin yazılmasına ehtiyac varmıydı? Bu ehtiyacın zəruriyyətdən doğduğunu yazmışdıq. Adətən, bu,

* Bu, xüsusilə, tərcümə olunmuş əsərlərə daha çox aiddir. F.S.

müəllifin və ya tərcüməçinin səlahiyyətinə aid məsələdir. O, müvafiq səviyyəli oxucusunu nəzərə alaraq mətnə müəyyən izahlar yazmaqda sərbəstdir ki, bu da mövzunun və yaxud mahiyyəti o qədər də aydın olmayan bir ifadənin, fikrin, tezisin aydınlaşdırılması ehtiyacından irəli gəlir. Arzu edək ki, tərcüməçilərimiz və digər qardaş və bacılarımız bu məqama diqqət yetirəcəklər.

Yuxarıda vəd etdiyim kimi, bir neçə söz də əsərin bu günümüz üçün vacib olmasını möhtərəm oxucunun nəzərinə çatdırmaq yerinə düşərdi. ................................

Ardını nəşr olunanda yazaram. F. Sələfi

# Əhməd bin Əbdülhəlim əl-Hərrani

# QƏLB XƏSTƏLİKLƏRİ VƏ MÜALİCƏSİ

Mərhəmətli və Rəhmli Allahın adı ilə!

Allaha həmd olsun! Ondan kömək istəyir və bağışlanma diləyirik. İstəklərimizin şərindən, əməllərimizin pisliklərindən Ona sığınırıq! Allah kimi doğru yola yönəldərsə, onu heç kim yolundan azdıra bilməz, kimi də yolundan azdırarsa, ona da kimsə doğru yol göstərə bilməz. Mən şahidlik edirəm ki, Allahdan başqa ilah yoxdur! O təkdir, heç bir şəriki yoxdur! Bir daha şahidlik edirəm ki, Muhəmməd Onun qulu və Elçisidir (ona, ailə üzvlərinə və səhabələrinə salat və salam olsun!

## QƏLB XƏSTƏLİKLƏRİ VƏ ŞƏFASI

Allah Quranda belə buyurur:

**"Onların qəlblərində xəstəlik vardır və Allah da onların xəstəliyini artırmışdır..."[1].**

Uca Allah:

**"*Belə edər ki,* şeytanın gizli təlqini, qəlbində xəstəlik olanlar və qəlbi sərt olan insanlar üçün bir sınaq *vasitəsinə* çevrilsin..."[2].**

**"Əgər ikiüzlülər, qəlbi xəstə olanlar və şəhərdə qarayaxma şayiələr yayanlar *öz yaramaz əməllərinə* son qoymasalar, səni onlara qarşı çıxmağa çağırarıq. Sonra onlar orada artıq səninlə ancaq qısa bir müddət ərzində qonşuluq edər və lənətlənmiş halda *qalarlar*"[3].**

**"Biz Cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik və onların sayını *on doqquza* qaldırdıq ki, *bu,* kafirlər üçün ancaq bir sınaq olsun, özlərinə Kitab verilənlər yəqinlik hasil etsinlər, iman gətirənlərin imanı artsın, Kitab verilənlər və möminlər *haqqa* şübhə etməsinlər və qəlblərində xəstəlik olanlar və kafirlər: "Allah bu məsəllə nə demək istəyir?" – desinlər. Allah istədiyi kimsəni belə azdırır,**

---

[1] Bəqərə, 2/10
[2] Həcc, 22/53
[3] Əhzab, 33/60-61.

**istədiyini də doğru yola yönəldir. Sənin Rəbbinin qoşunları barədə yalnız Özü bilir. Bu, bəşəriyyət üçün ancaq bir xatırlatmadır"[4].**

**"Ey insanlar! Rəbbinizdən sizə bir öyüd-nəsihət, köksləndə olana bir şəfa, möminlərə doğru yolu göstərən rəhbər və mərhəmət gəlmişdir"[5].**

**"Biz Quranda möminlər üçün bir şəfa və mərhəmət *olan ayələr* nazil edirik. *Bu ayələr* zalımların ancaq ziyanını artırır"[6].**

**"Onlarla vuruşun ki, Allah sizin əllərinizlə onlara əzab versin, onları rüsvay etsin, sizə onların üzərində qələbə çaldırsın, mömin camaatın qəlbini sevindirsin və möminlərin qəlbindən qəzəbi silib aparsın..."[7].**

## BƏDƏN XƏSTƏLİYİ

Bədən xəstəliyi sağlamlığın və onun (*Allaha*) qulluq xidmətinin ziddinə olan bir vəziyyətdir. Bu hal bədəndə baş verən nasazlıqlardan qidalanır. Bu nöqsanlar isə orqanizmin təbii təfəkkür qabiliyyətini və hərəkətini naqisləşdirir.

Təfəkkürdə  pozulma halı – korluq və karlıq kimi görmə və eşitmə orqanlarının sıradan çıxması ilə baş verdiyi kimi, şirini acı və əslində heç bir həqiqəti əks etdirməyən şeyləri gerçəklik kimi qavramaq, bir şeyi tərsinə başa düşmək və dərk etmək formasında da mümkün ola bilir.

İnsanın təbii davranışındakı pozuntu isə, iştahasızlıq, zəruri olan qida maddə-lərindən iyrənmə və zərərli olanlardan xoşlanma kimi özünü göstərə bilər. Faydalı olan təbii qida maddələrini ürəyin götürməməsi və əksinə, zərər verən şeyləri istəmə nəticəsində insan orqanizmində ağrılar baş verir. Lakin o, bu xəstəliyə baxmayaraq ölüb yox olmur, onda az da olsa, iradəsini toplayıb bəzi hərəkətlər etmək imkanı tapılır. Beləliklə, kəmiyyət və ya keyfiyyət pozulmasına görə orqanizmdə olan ağrılar üzə çıxır.

Birincisi, kəmiyyətdəki pozğunluq maddələrin çatışmazlığından ola bilər. Belə halda qidalanmaya ehtiyac yaranır, onda qida qəbul edilməlidir, əks halda isə, ola bilsin ki, orqanizmdə çoxlu qida maddələri yığılır ki, onlar bayıra atılmalı, bədəndən kənarlaşdırılmalıdır.

İkincisi, keyfiyyət pozğunluğu yüksək hərarət və ya soyuqluğun təsirindən də yarana bilər. Belə vəziyyətdə müalicə vacibdir.

## XƏSTƏ QƏLB VƏZİFƏSİNİN ÖHDƏSİNDƏN GƏLƏ BİLMƏZ

[4] Müdəssir, 74/31
[5] Yunus, 10/57
[6] İsra, 17/82
[7] Tövbə, 9/14-15

Elə qəlb xəstəlikləri də eynilə orqanik xəstəliklər kimidir. Qəlb xəstəliyi qəlbdə törəyən nasazlığın bir növüdür. Bu pozuntu qəlbin təsəvvür və iradəsini korlayır. Qəlb artıq onu çulğamış şübhələri təsəvvürünə gətirir, o, elə bir vəziyyətə düşür ki, daha haqqı görə bilmir və yaxud onu görsə də, onun əsil halının əksini görməyə başlayır. Qəlbin iradəsində törəyən pozğunluq isə, faydalı həqiqətdən çəkinməyə, ona nifrət etməyə və zərərli olan batil əməllərə aludə olmaq kimi üzə çıxır.

Məhz buna görə Uca Allah buyurur:

**"Onların qəlblərində xəstəlik vardır..."**[8]

Ayədəki xəstəlik (mərəz) bəzən Mücahidin və Qətadənin təfsir etdiyi kimi, şəkk və şübhə formasında şərh olunmuş, bəzən də:

**"...qəlbində xəstəlik olan tamaha düşər..."**[9] ayəsində olduğu kimi, zinakarlıq istəyi, arzusu və şəhvət kimi təfsir edilmişdir.

Buna görə, Həraiti "İtilalil-kulub" ("Qəlb xəstəliyi") adlı kitabını yazaraq, orada qəlb xəstəliyini "şəhvət" sözü ilə ifadə edərək təsnifləşdirmişdir.

Sağlam adamı narahat etməyən şeylər xəstəni rahatsızlaşdırır. Buna görə, xəstə adam xəstəliyi üzündən zəiflədiyi üçün, bir az istiyə və ya soyuqluğa, işləməyə və buna bənzər bir çox işlərə tab gətirə bilmir. Ümumiyyətlə xəstəlik insanın qüvvəsini zəiflədərək, normal bir adamın bacaracağı bir işdə, onu taqətdən salır. Sağlamlıq sağlamlıqla mühafizə edilir, onun əksi ilə isə xəstəliyə çevrilir. Xəstəlik isə, xəstəliyə səbəb olan şeylərlə güclənir, onların əksi ilə sağlamlığa çevrilir. Xəstənin xəstəliyinə səbəb olan hər hansı bir şey (yenə) baş verirsə, bu onun xəstəliyini daha da artırır, onu daha da gücsüzləşdirib zəiflədir və xəstə elə bir hala düşür ki, çox vaxt həlak olur. Əgər ona gücünü artıran, xəstəliyini müalicə edən şeylər verilirsə, o zaman o, yaxşılaşır.

## QƏLB XƏSTƏLİYİ QƏLBDƏ YARANAN BİR AĞRIDIR

Qəlb xəstəliyi, səni ələ alan düşmənə qarşı hiss etdiyin qəzəb kimi qəlbdə yaranan bir ağrıdır. Həqiqətdə də düşmənin qəlbə çalması ürəyi ağrıdır.

Uca Allah belə buyurur:

**"Onlarla vuruşu ki, Allah sizin əllərinizlə onlara əzab versin, onları rüsvay etsin, sizə onların üzərində qələbə çaldırsın, mömin camaatın qəlbini sevindirsin və möminlərin qəlbindən qəzəbi silib aparsın..."**[10]

Ayədə möminlərin sağalıb sevinməsi - ağrının qəlblərindən silinib getməsi deməkdir. Məsələn, belə deyirlər: "Filankəsin ürəyi yüngülləşdi". Qisas məsələsində də öldürülənin havadarının və ya yaxınlarının sevinməsindən bəhs edilir. Öldürülənin qisası alındıqda onun yaxınları bir növ sevindirilir, acı-ağrıdan xilas edilir. Bütün bunlar insanın nəfsində olan ağrı-acılardır.

---

[8] Bəqərə, 2/10
[9] Əhzab, 33/32
[10] Tövbə, 9/14-15

Şəkkaklıq və nadanlıq da qəlbə eynilə bu cür ağrı verir. Peyğəmbər (s.ə.s.) belə buyurub: ***"Bilmədikləri halda, soruşmalı idilər. Çünki nadanlığın (bilməməzliyin) müalicəsi soruşmaqdır"***[11].

Şübhələndiyi bir şeyə şəkk gətirən adamın bu vəziyyəti, qəti məlumat əldə edənə qədər, onun qəlbini incidir. Belə ki, cavabı ilə həqiqəti bəyan edən alim haqqında isə deyilir: "Cavabı ilə məni sağaltdı".

Xəstəlik – ölüm deyil. Çünki qəlb qatı bir nadanlıqdan ölərkən, nadanlığın hər hansı bir növü ilə xəstələnmiş olur. Beləcə, qəlb ölmək, xəstələnmək və sağlamlaşmaq kimi xassələr əldə edir. Qəlbin ölümü, xəstəliyi və müalicəsi bədənin ölümü, xəstəliyi və müalicə edilməsindən daha vacib və əhəmiyyətlidir. Buna görə də qəlb xəstəliyinə şübhə və şəhvət də əlavə olunduqda onun mərəzi əməllicə artır. Əgər qəlbə hikmət və nəsihət verilərsə, bu onun yaxşılaşmasına və sağalmasına səbəb olar.

Uca Allah belə buyurur:

**"*Belə edər ki,* şeytanın gizli təlqinini qəlbində xəstəlik olanlar və qəlbi sərt olan insanlar üçün bir sınaq *vasitəsinə* çevrilsin..."**[12].

Çünki şeytanın təlqini, qəlbi xəstə olanlarda xəstəlikləri üzündən, qəlbi sərt olan insanlarda isə kobudluq və sərtlikləri üzündən şübhəyə səbəb olur. Beləliklə də, şeytanın onların zehninə yeritdiyi (vəsvəsə) fitnəyə çevrilir. Qəlbi imana qarşı sərtləşmişlər də fitnəyə düçar olurlar.

Uca Allah buyurur:

**"Əgər ikiüzlülər, qəlbi xəstə olanlar və şəhərdə qarayaxma şayiələr yayanlar *öz yaramaz əməllərinə* son qoymasalar..."**[13]

Sonra Uca Allah belə buyurur:

**"...qəlblərində xəstəlik olanlar və kafirlər: "Allah bu məsəllə nə demək istəyir?" – desinlər..."**[14]

Bu ayələrdə göstərildiyi kimi, xəstə qəlb kafir və münafiq qəlbləri kimi ölməmiş-dir, lakin əməlisaleh insanların qəlbi kimi sağlam da deyildir. O qəlblərdə bilavasitə şübhə və şəhvətli hisslərdən qaynaqlanan xəstəliklər vardır.

Uca Allah yenə:

**"...qəlbində xəstəlik olan tamaha düşər..."**[15] – deyə buyurur.

Bu ayədə xatırlanan xəstəlik şəhvət xəstəliyidir. Çünki sağlam qəlb hər hansı bir qadını gördükdə, çevrilib ona ehtirasla baxmaz. Amma şəhvət xəstəliyinə düçar olmuş bir qəlb iradəsinin zəifliyinə görə və xəstəliyinin qüvvəsinə tabe olaraq gözünə görünən

[11] Hədisi bu sözlərlə hər hansı bir kitabda tapa bilmədim. Ancaq bu hədis İbn Macə, hədis N 572 və Əbu Davud, hədis N 332-333-də başqa sözlərlə ayrı mənada keçir. Ayrıca Darekutni, 1/157; Əhməd, 1/380; İbn Hüzeymə, 1/138; Taberani, "Kəbir", 11472; İbn Hibban, 201, ərəbcədən çevirən.
[12] Həcc, 22/53
[13] Əhzab, 33/60
[14] Müdəssir, 74/31
[15] Əhzab, 33/32

qadına doğru meyl edəcəkdir. Xüsusilə, həmin qadınlar özlərini cəzbedici əda ilə apardıqda, qəlbi xəstə olanlar onlara tamah salacaq və onları arzulayacaqlar.

Quran könüllərdə olana, qəlbində şübhə və şəhvət olanlara şəfadır. Çünki Quranda əsassız şeyləri aradan qaldıran həqiqət dəlilləri var. Bax bu dəlillərlə, elmi, təsəvvürü və ağlı korlayan şübhə mərəzi yox ediləcək və beləliklə, bundan sonra qəlb əşyanı olduğu kimi görə biləcəkdir. Quranda həm də hikmət, qəlbi pis əməllərdən çəkindirib gözəl nəsihət verən və onu sağlamlaşdıran ibrətli hekayətlər vardır. Belə bir qəlb ancaq ona fayda verən şeyləri arzulayar, zərər verənlərdən uzaqlaşar. Nəticədə, azğınlığa can atan, düzlüyə nifrət bəsləyən qəlb, doğruçuluğu sevən və azğınlığa nifrət edən bir vəziyyətə gələcəkdir.

Quran zəifləmiş iradə və istəklərə səbəb olan xəstəlikləri yox edir. Nəticədə, qəlbin düzəlməsi ilə iradə də möhkəmlənir və öz əvvəlki əzəli, təbii vəziyyətinə qayıdır. Beləliklə, müalicə olunmuş bir orqanizm öz təbii halına döndükdə, qəlb də ona uyğun olaraq fitrət halına qayıdır. İnsan orqanizmi onu inkişaf etdirən, sağlamlaşdıran maddələrlə təmin edildikdə yaxşılaşdığı kimi, qəlb də eynilə onu təmizləyən, inkişaf etdirən və qüvvətləndirməyə kömək edən Quran və imanla qidalanıb bəslənir. Qəlbin nüfuzunun *ləkələrdən* təmizlənərək artması, bədənin *sağlamlığının* möhkəmlənməsi kimidir.

Zəkat sözü ərəb dilində səpilmə, tərəqqi, çoxalma və yararlı olanın artması mənasını verir. Yararlı və yaxşı olan şeydə artım olmasına "zekaş-şeyu" deyilir. Bədən nə dərəcədə özünə zəruri olan qidaları qəbul edib böyüməyə, inkişafa ehtiyac duyursa, qəlb də kamilliyə çatana qədər bəslənib böyüdülməyə və *saflığını* artırmaya möhtacdır. Bununla bərabər, ona zərərli olan şeylərdən hökmən uzaqlaşdırılıb, maneə yaradılması lazımdır. İnsan orqanizmi, ona faydalı olanları verib, zərərlilərdən uzaqlaşdırılmadıqca, sağlamlaşmayacağı kimi, eynilə qəlbin də, ona yararlı, faydalı olanı verib, zərərli olanı ondan uzaqlaşdırmadıqca, təmizlənib kamilliyə yetişməsi mümkün olmayacaqdır. Əkin sahəsinin vəziyyəti də eynilə belədir.

Sədəqə, suyun odu söndürdüyü kimi, xətaları necə yuyursa, qəlb də sədəqə ilə beləcə təmizlənir. Qəlbin təmizlənməsi və nüfuzu, onun günahlardan təmizlənməsinin artdığını göstərir. Belə ki, Uca Allah buyurur:

**"Onların mallarından sədəqə götür ki, bununla onları pak edib təmizə çıxarasan..."**[16]

Qəlbin eynilə təmizlənməsi həm də bütün pozğunluqları (hər cür günahları, kinli sözləri və hərəkətləri) tərk etməklə mümkünləşir.

Günahların tərk edilməsi də belədir. Çünki günahlar qəlb üçün, bədəndəki zərərli maddələr kimidir. Sıx ağacların, çör-çöpün əkin sahəsinə *pis* təsir göstərdiyi kimi. Orqanizmdə olan yararsız maddələr (artıq qanın alınması kimi) boşaldılıb atılırsa, bədən təbii gücünü özünə qaytarır, rahatlaşır və beləcə normal fəaliyyət göstərməyə başlayır. Qəlb də vəziyyəti belədir. *İnsan* günahlarından tövbə etdikcə, zərərli maddələr qəlbdən çəkilir. Çünki insan günah işlətməklə yaxşı əməllərinə pisliklər qarışdırır. Buna

---

[16] Tövbə, 9/103

görə də, tövbə edildikdə, qəlbin qüvvəsi və iradəsi xeyirxah işlər görmək üçün xilas olur, daxilindəki günahkarlıqlardan törəmiş *pisliklərdən təmizlənərək* rahatlığa qovuşur. Qəlbin günahlardan təmizlənməsi onun kamilliyə yetişməsi ilə nəticələnir.

Uca Allah buyurur:

**"...Əgər Allahın sizə lütfü və mərhəməti olmasaydı, sizdən heç kəs heç vaxt təmizə çıxmazdı. Lakin Allah dilədiyini təmizə çıxardır..."**[17]

**"...Sizə: "Qayıdın!" – deyilsə, qayıdın. Bu, sizin üçün daha təmizdir..."**[18]

**"Mömin kişilərə de ki, *harama baxmayıb* gözlərini aşağı diksinlər və cinsiyyət üzvlərini *zinadan* qorusunlar. Çünki bu, onlar üçün daha təmiz olar. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır"**[19]

**"*Günahlardan* təmizlənən kimsə isə uğur qazanmışdır. *O kimsə ki,* Rəbbinin adını xatırlayıb namaz qılmışdır"**[20]

**"Nəfsini *günahdan* təmizləyən uğur qazanmışdır. Onu *günaha* batıran isə ziyana uğramışdır"**[21]

**"Nə bilirdin ki, bəlkə o, *günahlardan* təmizlənəcəkdi və yaxud nəsihət dinləyib faydalanacaqdı"**[22]

**"De: "*Günahlardan* xilas olmaq istəyirsənmi? Səni Rəbbinə doğru yönəldimmi ki, *Ondan* qorxub çəkinəsən?"**[23]

Günahlardan təmizlənmə, xeyrin artması və bərəkət mənasını bildirirsə, o, ancaq şərin yox edilməsi ilə mümkün olur. Bax buna görə günahlardan təmizlənmə (təzkiyyə) hər iki məqamı özündə birləşdirməkdir.

Uca Allah buyurur ki:

**"...Vay müşriklərin halına! O kəslərin ki, zəkat vermir və axirəti inkar edirlər"**[24]

Bu ayədə "zəkat" deyildikdə, tövhidə və qəlbin onun vasitəsilə günahlardan təmizləndiyi və artdığı imana işarə edilir. Həqiqətən də, tövhid qəlbdə haqq olan Allahdan başqa, digər tanrıçaların ilahiliyini rədd edərək, orada həqiqi Allahın yerləşdiyini ifadə edir. "Lə ilahə illallah" gerçəkliyi də elə budur. (??? *Müəllif Əbdülhəlim Hərrani Allahın qəlbdə olduğunu iddia edir???Amma ola bilər ki, bu türk tərcüməçisinin səhvidir. Çünki qəlbin həqiqi Allahı anması ilə Allahın qəlbdə olması məfhumları başqa-başqa şeylərdir. F.S. Ərəb mətninə baxmaq lazımdır!)* Bax bu, qəlbin əsil mənada təmizlənməsinin əsasıdır.

---

[17] Nur, 24/21
[18] Nur, 24/28
[19] Nur, 24/30
[20] Əla, 87/14 -15
[21] Şəms, 91/9-10
[22] Əbəsə, 80/3-4
[23] Naziat, 79/18-19
[24] Fussilət, 41/6-7

## GÜNAHLARDAN TƏMİZLƏNMƏ

Günahlardantəmizlənmə - bir şeyin arınıb durulması və təmiz olmasını qəbul etmək və onu belə saymaq deməkdir. Bu, həmin şeyin ancaq özündə ola biləcəyi kimi, həm də imanına və verəcəyi məlumata aid ola bilər. Məsələn, "adeltuhu" sözü bir adamı öz nəfsində ədalətli olduğunu qəbul etmək və yaxud da insanların onun barəsindəki rəylərində ədalətli olduğunu qəbul etmək mənasını verir.

Uca Allah buyurur ki:

**"...Özünüzü təmizə çıxartmayın! Çünki O, kimin *Allahdan* qorxduğunu yaxşı bilir"**[25]

Yəni, Mənə nəfsinizin təmiz, təmizlənmiş olduğunu xəbər verməyin. Aydındır ki, yuxarıdakı ayənin mənası, bu ayənin mənasından fərqlidir: **"Təmizlənən, nəfsini təmizləyən həqiqətən xilas olmuşdur".**

Məhz buna görə Uca Allah buyurur:

**"Çünki O, kimin *Allahdan* qorxduğunu yaxşı bilir".**

Zeynəbin (Allah ondan razı olsun) adı Bərrə[26] idi. Deyildi ki: "Bu, özünü günahlardan təmizləyib təmizə çıxarır". Buna görə, Allahın Elçisi (ona Allahın salavatı və salamı olsun) onun adını dəyişdirib Zeynəb[27] qoydu.

Uca Allah bu ayəsi ilə özünü təmiz hesab edən və təmiz olduğunu bildirənlərə isə belə buyurur:

**"Özlərini öyənləri görmürsənmi? Xeyr! Allah istədiyini tərifləyər və onlara xurma çərdəkindəki tel qədər haqsızlıq edilməz"[28].**

Eynilə günahdan təmizlənən bir adamın, şahidləri ədalətli olduğu üçün təmizə çıxarması və yaxşı şəxslər olduqlarını xəbər verməsi kimidir.

Ədalət – mötədillik deməkdir. Mötədillik isə qəlbin xeyirxahlığı, düzgünlüyü deməkdir. Əgər zülm – qəlbin pozulması deməkdirsə, ədalət onun düzəlməsi deməkdir. Zülm qəlbin pozulması olduğundan, bütün günahların törədilməsində günahkar olan şəxs özünə zalımlıq və nəfsinə zülm etmiş olur. Zülm ədalətin əksidir. Belə olduğu təqdirdə, günah iş tutan bir adam öz nəfsinə qarşı ədalətli olmamış, əksinə ona zülm etmişdir. Çünki qəlbin yaxşılaşması, müvafiqliyi və düzəlməsi ədalətlə *davranmada,* onun pozulması, günahkarlığı isə zülm etməkdədir. Allahın qulu özünə zülm etdikdə həm zalım və həm də məzlum vəziyyətində olur. Onun ədalətli olması da eynilədir – o, həm adil, həm də özünə ədalətlilik göstərən şəxsdir. Əməl də bu qəbildəndir. Xeyir və ya şərdən ibarət olan əməlin nəticəsi onu edənin üstünə qayıdır. Uca Allah belə buyurur:

---

[25] Nəcm, 53/32
[26] Bərr – doğru, dürüst, hörmətli, dindar mənalarını verir. Türk. çevirən.
[27] Xoş iyli bir ağac adıdır. Türk. çevirən.
[28] Nisa, 4/49

**“...Hər kəsin qazandığı *xeyir yalnız* onun özünə, qazandığı *şər də yalnız* öz əleyhinədir...”**[29]

## ƏMƏL

Yerinə yetirilən əməlin xarici təsirindən əvvəl, faydalılıq, ziyanlılıq, uyğunluq və düzəlmə nəzər nöqtəsindən qəlbə təsiri vardır. Görülən işin yaxşı olması nəfsə *yönəldilmiş* ədalətlilik, pis olması isə zülmdür.

Uca Allah belə buyurur:

**“Kim yaxşı iş görsə, *xeyri* özünə, kim də pislik etsə, *zərəri* özünə olar...”**[30]

**“Yaxşılıq etsəniz, özünüzə yaxşılıq etmiş, pislik etsəniz öz əleyhinizə etmiş olursunuz...”**[31]

Sələflərdən bəziləri belə deyiblər:

“Şübhəsiz ki, yaxşılıq qəlbdə nur, bədəndə qüvvət, üzdə aydınlıq, ruzidə bolluq və insanların qəlblərində sevgi yaradır. Şübhəsiz ki, pislik qəlbdə qaranlıq, üzdə qaralıq, bədəndə zəiflik, ruzidə azalma və insanların qəlbində nifrət oyadır”.

Uca Allah belə buyurur:

**“...Hər kəs qazandığının girovudur”**[32]

**“Hər bir kəs qazandığının girovuna çevrilir”**[33]

**“Dinlərini oyun və əyləncə sayanları və dünya həyatının aldatdığı şəxsləri tərk et. Bununla xatırlat ki, heç kəs qazandıqlarına görə özünü məhvə məhkum etməsin. Allahdan başqa onun nə bir hamisi, nə də bir havadarı olacaqdır. O, nə cür fidyə versə də, ondan qəbul olunmayacaq. Onlar qazandıqları *günahlara* məhvə məhkum olanlardır...”**[34]

Beləliklə, bədən xəstəlikdən sağalan kimi, **“itədələ mizacuhu” (**yəni, təbiəti dəyişdi, sağaldı) deyilir. Xəstəlik, adətən, insanın mizacının (təbii halının) pozulmasından ibarətdir. Bu hal həm də əsil dəyişiklik, zərərli maddələrin orqanizmə yol tapmasına maneə yaradır. Ancaq bu vəziyyət, ən mükəmməl olduqca həddən çıxmağa səy göstərmir və təmkinliliyə yaxınlaşdıqca, dəyişir. Bax, qəlbin sağlamlığının onun ədalətliliyi ilə əlaqədar olması kimi, onun əyriliyi, zülmü və azğınlığı da xəstələnməsinə səbəbdir.

Hər hansı bir sahədə sırf ədalətli olmaq, elmi və əməli baxımdan ya çətin olur, ya da imkan xaricindədir. Burada ən yaxşı və, *ədalətliliyə* yaxınlığa görə, vəziyyət müxtəlifdir. Buna görə deyilir ki, bu misal ən yaxşı misaldır. Sələfi yolu da “ət-tarikatul-musla”, yəni ən yaxşı, ən ideal yol adlandırılmışdır.

---

[29] Bəqərə, 2/286
[30] Fussilət, 41/46
[31] İsra, 17/7
[32] Tur, 52/21
[33] Müdəssir, 74/38
[34] Ənam, 6/70

Uca Allah buyurur:

**“Siz nə qədər istəsəniz də, arvadlar arasında ədalətlə davrana bilməzsiniz...”[35]**

**“...Ölçüyə və çəkiyə ədalətlə tam riayət edin. Biz hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər yükləyərik”[36]**

**BƏRABƏR**

Allah, insanlar arasında ədaləti, bərabərliyi həyata tətbiq etsinlər deyə peyğəmbərlərini göndərmiş və kitablar nazil etmişdir. Ən yüksək ədalət olan bərabərlik[37] – heç bir şərik qoşmadan tək Allaha qulluq etmək, sonra insanların haqlarını onlara ədalətlə vermək, daha sonra öz nəfsi ilə ədalətli davranmaq deməkdir.

**ZÜLM**

Zülm üç hissəyə ayrılır. Zülmün hamısı qəlbin xəstəliklərindəndir. Ədalət isə qəlblərin sağlamlığı və yaxşılaşmasıdır.

Əhməd b. Hənbəl bir sıra adamlara demişdir: “Sağlam olsaydın heç kimdən qorxmazdın”. Bu isə o deməkdir ki, sənin hər hansı yaradılmış məxluqdan qorxmağının səbəbi qəlbindəki şirk və günahdan törəyən xəstəliklərdir.

Qəlbin yönəldiyi istiqamətin təməlində duran onun canlılığı, həyatiliyi, nur saçması və işıqlanmasıdır.

Uca Allah bununla əlaqədar belə buyurur:

**“Məgər ölü ikən diriltdiyimiz və özünə də insanlar arasında gəzmək üçün nur verdiyimiz şəxs qaranlıqlar içində qalıb oradan çıxa bilməyən kəs kimi ola bilərmi?...”[38]**

Elə buna görədir ki, Uca Allah Kitabının bir çox yerlərində qəlbin həyatını, nurunu, ölümünü və qaranlıq zülmətini xatırladır. Aşağıdakı ayələrdə olduğu kimi:

**“diri olanları qorxutsun və kafirlər barəsindəki söz gerçəkləşsin”[39]**

**“Ey iman gətirənlər! *Peyğəmbər* sizi, həyat verəcək şeylərə çağırdığı zaman Allahın və Peyğəmbərinin çağırışına cavab verin. Bilin ki, Allah insanla onun qəlbi arasındadır və siz Onun hüzuruna toplanacaqsınız”[40].**

**“O, ölüdən diri, diridən də ölü çıxardır...”[41]**

---

[35] Nisa, 4/129
[36] Ənam, 6/152
[37] Türk mətnində “kıst” kimi verilmişdir. “Kıst” söz kimi ədalət, *bərabərlik,* hissə, parça, pay mənalarını bildirir. Türk dilində “taksit” sözü də bu kəlmədən törəmədir; bir borcu, bir haqqı haqq sahibinə məlum və bərabər hissələrlə verməyi, ödəməyi bildirir. Türk çevirən. “Bərabərlik” sözünü mən seçdim. F.S.
[38] Ənam, 6/122 (Bu ayə türk mətnində, yəqin ki, səhvən, 123-cü sayla verilmişdir. F.S.).
[39] Yasin, 36/70
[40] Ənfal, 8/24
[41] Rum, 30/19

Allahın ölüdən diri çıxarmasının üsullarından biri də, səhih bir hədisdə rəvayət edildiyi kimi, kafirdən mömin çıxarmasıdır:

***"İçində Allahın adının çəkildiyi ev ilə çəkilmədiyi evin vəziyyəti, ölü ilə dirinin vəziyyəti kimidir"[42].***

Digər bir səhih hədisdə isə belə deyilir:

***"Namazınızın bir hissəsini evlərinizdə qılın. Onları qəbirlərə çevirməyin"[43].***

Uca Allah belə buyurur:

**"Ayələrimizi yalan sayanlar qaranlıqlar içində *qalmış* karlar və lallardır..."[44]**

Uca Allah işıq və qaranlıq ayəsini nəzərdə tutaraq buyurur:

**"Allah göylərin və yerin nurudur. Onun *möminlərin qəlbində olan* nuru, içində çıraq olan bir taxçaya bənzəyir; o çıraq şüşənin içindədir, şüşə isə, sanki inci kimi bir ulduzdur. O *çıraq* təkcə şərqə və ya təkcə qərbə aid edilməyən *daim günəş şüaları altında qalan* mübarək zeytun ağacından yandırılır. Onun yağı özünə od toxunmasa da, sanki işıq saçır. *Bu,* nur üstündə nurdur. Allah dilədiyini Öz nuruna yönəldir. Allah insanlar üçün misallar çəkir. Allah hər şeyi Biləndir"[45]**

Budur, bu, möminlərin qəlbindəki nura dair məsəldir. Bundan sonra Uca Allah yenə belə buyurur:

**"Kafirlərin əməlləri səhradakı ilğıma bənzəyir ki, susamış kimsə onu su hesab edər. Ona yaxınlaşdıqda isə, onun heç nə olduğunu görər. O öz yanında Allahı tapar. O da onun cəzasını verər. Allah tez haqq-hesab çəkəndir. Yaxud *onların əməlləri* əngin dənizdəki qaranlığa bənzəyir. Onu bir dalğa, onun üstündən də *başqa* bir dalğa örtər; onun da üstündə olan bir bulud vardır; bir-birinin üstündə olan qaranlıqlar! *İnsan* əlini çıxartsa, az qala onu görməz. Allah kimə nur verməsə, onun nuru olmaz"[46].**

*(İki ayədən ibarət olan bu Allah kəlamında)*[*] birinci ayə *kafirlərin* azğın etiqadlarına aid çəkilmiş məsəldir ki, əslində əməllər də həmin o naqis inanclara uyğundur. Belə azğın etiqad sahibi tutduğu əməllərin özü üçün faydalı olduğunu zənn etdiyi halda, törətdiklərinə yaxınlaşıb baxdıqda, onların özünə heç bir xeyir verməyəcəyini başa düşər. Allah da, bu törətdiklərinə görə, onlara əvəzini bütövlüklə verər.

İkinci ayədə isə, imanın və elmin olmaması ilə yanaşı, adi bir nadanlığın hökm sürdüyü də izah edilir. Belə bir insan bir-birinin üstünə qalanmış, heç nəyi görməyin mümkün olmadığı qaranlıqlar əhatəsindədir. Çünki ancaq elm və iman işığı ilə görmək mümkünləşir. Uca Allah belə buyurur:

---

[42] Müslim, hədis N 779
[43] Müslim, hədis N 777
[44] Ənam, 6/39
[45] Nur, 24/35
[46] Nur, 24/39-40
[*] Tərcüməçinin izahı. F.S.

**“Allahdan qorxanlara şeytandan bir vəsvəsə toxunduğu zaman *Allahı* xatırlayar və dərhal *gerçəyi* görərlər”**[47]

**“*Qadın* ona meyl etmişdi. Əgər *Yusuf* Rəbbinin dəlilini görməsəydi, o da ona meyl edərdi...”**[48]

Yusufun gördüyü, qəlbindəki imanın sübutu, dəlilidir. Allah da o dəlillə onu arzuladığı şeydən uzaqlaşdırdı və ona bütöv bir yaxşılıq yazdı. Amma hər hansı bir pislik yazmadı. Çünki Yusuf pislik deyil, xeyirli iş görmüşdü. Buna görə Uca Allah buyurur:

**“...*Bu,* insanları öz Rəbbinin izni ilə qaranlıqlardan nura – Qüdrətli, Tərifəlayiq *Allahın* yoluna çıxartmaq üçün sənə nazil etdiyimiz bir Kitabdır”**[49]

**“Allah iman gətirənlərin Himayədarıdır, onları zülmətlərdən nura çıxarır. Kafirlərin dostları isə tağutlardır, onları nurdan zülmətə salarlar...”**[50]

**“Ey iman gətirənlər! Allahdan qorxun və Onun elçisinə iman gətirin! Onda O, sizə Öz mərhəmətindən iki pay bəxş edər, sizə *düz yolla* getməyiniz üçün nur verər...”**[51]

Bax buna görədir ki, Allah imandan ötrü iki misal çəkmişdir. Biri – əsasında həyatın yaradıldığı su və onunla birlikdə olan köpükdür, digəri – işığın törədən oddur və *odun* üstündə yandırılaraq əridilən köpükdür.

*Allah* eynilə nifaq üçün də iki misal çəkmişdir:

**“O, göydən su endirir və vadilər ölçülərinə uyğun öz məcralarından daşaraq sel olub axır. Sel də üzə çıxmış bir köpüyü götürüb aparır. Bəzək şeyləri və ya *başqa* əşyalar düzəltmək üçün *insanların* odda qızdırıb əritdikləri şeylərin üstündə də buna bənzər bir köpük olur. Allah haqqa və batilə belə misallar çəkir. Köpük yox olub gedir, insanlara fayda verən şeylər isə yerində qalır. Budur Allahın çəkdiyi misallar!”**[52]

Uca Allah münafiqlər barəsində isə belə buyurur:

**“Onların məsəli *zülmət gecədə* od qalayan kimsənin məsəlinə bənzər. Alov onun ətrafındakıları işıqlandırdığı zaman Allah onların nurunu aparar, özlərini də *heç bir şey* görə bilməyəcəkləri zülmətlər içərisində buraxar. *Onlar* kar, lal və kor olduqlarına görə *doğru yola* qayıtmazlar. Yaxud onların *məsəli* zülmət içində göy gurultusu və şimşəklə yağan leysana *düşənlərin məsəlinə* bənzəyir ki, ildırımdan ölmək qorxusu ilə barmaqlarını qulaqlarına tıxayırlar. Şübhəsiz ki, Allah kafirləri *hər tərəfdən* əhatəyə almışdır. Şimşək az qalır ki, onların gözlərini çıxartsın. *Şimşək hər dəfə* onların *yolunu* işıqlandırdıqda onunla gedirlər, zülmət onları bürüdükdə isə**

[47] Əraf, 7/201
[48] Yusuf, 12/24
[49] İbrahim, 14/1
[50] Bəqərə, 2/257
[51] Hədid, 57/28
[52] Rəd, 13/17

**dayanıb dururlar. Əgər Allah istəsəydi, onları eşitməkdən və görməkdən məhrum edərdi. Şübhəsiz ki, Allah hər şeyə qadirdir"**[53]

Allah münafiqlər üçün odla bağlı ibrətamiz kəlamında, ətrafını hər dəfə işıqlandırmağa cəhd göstərən bir nəfəri misal gətirir. Su ilə bağlı ayəsində isə qatı qaranlıqlar, şimşəklər və ildırımlarla qapalı göydən sel kimi yağdırdığı yağışı misal çəkir. Bu ibrətli məsəllər haqqında sözü uzadıb genişləndirmək bir başqa mövzudur. Burada məqsədimiz ancaq qəlb həyatı və onun nurlanmasından bəhs etməkdir. Peyğəmbərimizdən (s.ə.s.) rəvayət edilən bir duada belə deyilir: ***"Allahım, Quranı qəlbimizin baharı və köksümüzün nuru et"***[54]**.**

Hədisdəki "bahar" sözü, səmadan endirilib, bitkilərin cücərməsini təmin edən yağışı ifadə edir. Peyğəmbər (s.ə.s.) belə buyurmuşdur: ***"Yağışın cücərtdiyi bəzi otlar heyvanı şişirdərək öldürür və yaxud bəzən öldürür"***[55]**.**

Ərəblər bitkilərin artmasını təmin edən yağışın yağdığı mövsümə "yaz" adını vermişlər. Ərəb olmayanlar isə, qışın ardıyca gələn mövsümə "yaz" deyirlər. Çünki məhz bu mövsümdə meyvələrin yarandığı çiçəklər açılır və ağaclar yarpaq gətirir.

## DİRİ QƏLB

Daxilindəki nurdan işıqlanan, canlı, diri qəlb – həm eşidir, həm görür və həm də dərk edir. Ölü qəlb isə, nə eşidər, nə də görər. Uca Allah belə buyurur:

**"Kafirlərin məsəli çığırtı və bağırtıdan başqa bir şey anlamayanları (heyvanları) haylayanın (çobanın) məsəlinə bənzəyir. Onlar kar, lal və kordurlar, *haqqı* anlamazlar"**[56]

**"Onlardan səni dinləyənlər də vardır. Məgər karlara - əgər anlamırlarsa, sənmi eşitdirəcəksən? Onlardan sənə baxanlar da vardır. Məgər korları - əgər görmürlərsə, sənmi doğru yola yönəldəcəksən?"**[57]

**"Aralarında səni dinləyənlər də vardır. Quranı anlamasınlar deyə onların qəlblərinə pərdə çəkdik, qulaqlarına da tıxac vurduq. Onlar istənilən ayəni görsələr belə, yenə də ona inanmazlar. Hətta sənin yanına gəldikdə səninlə mübahisə edirlər. Kafir olanlar: "Bu, keçmişdəkilərin əfsanələrindən başqa bir şey deyildir" – deyərlər"**[58]

---

[53] Bəqərə, 2/17-20
[54] Əhməd, 1/391, 452
[55] Buxari, hədis N 1465; Müslim, hədis N 1052; İbn Macə, hədis N 3995; Əhməd, 3/7-21
[56] Bəqərə, 2/171
[57] Yunus, 10/42-43
[58] Ənam, 6/25

Bu ayələrdə Uca Allah bizə o şəxslərin qəlb ilə düşünmədiklərini, qulaqları ilə eşitmədiklərini və gördükləri nura[59] da iman gətirmədiklərini xəbər verir. Beləliklə, onlardan bəhs edirkən Uca Allah buyurur:

**“Onlar dedilər: “Sənin bizi dəvət etdiyinə qarşı qəlbimiz qapalıdır, qulaqlarımızda tıxac vardır, bizimlə sənin arana pərdə çəkilmişdir. Sən işində ol, biz də öz işimizdə olacağıq”**[60]

Kafirlər qəlblərində, qulaqlarında və gözlərində olan maneələr haqqında belə düşünürlər. Halbuki onlar canlıdır, səsləri eşidir və başqa insanları görürlər. Lakin qəlb həyati ilə yaşamadıqlarına görə, ancaq orqanlarının yaşaması heyvan həyatı sürməyə bərabərdir. Heyvanlarda da qulaq və göz var, onlar da yeyir, içir və cinsi əlaqəyə girirlər. Elə buna görə Uca Allah deyir:

**“Kafirlərin məsəli çığırtı və bağırtıdan başqa bir şey anlamayanları (heyvanları) haylayanın (çobanın) məsəlinə bənzəyir...”**[61]

Allah onları, çobanın qışqırıb-bağırmasından başqa bir şey eşitməyən qoyuna bənzətmişdir. Belə ki, bir başqa ayədə belə buyurulur:

**“Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər, hətta, *haqq* yoldan onlardan daha çox uzaqlaşmışlar”**[62]

**“Biz Cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq. Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər. Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar. Qafil olanlar da məhz onlardır”**[63]

**“İnsanlara bəla üz verdikdə uzananda da, oturanda da, ayaq üstdə olanda da Bizi çağırar. Bu bəlanı ondan sovuşdurduqda isə sanki ona üz vermiş bəladan ötrü Bizi çağırmamış kimi çıxıb gedər...”**[64]

Bu və insanların qüsurlarından və qınanılmasından bəhs edən digər ayələr haqqında təfsir alimləri demişlər: “Bu ayələr kafirlər haqqındadır və onlarda xatırlanan insanlar – kafir olanlardır”. Buna görə, bu ayələri eşidən bir adam, müsəlman olduğunu deyən insanlara bu ayələrdəki qınaq və təhdidlərin aid olmadığını bilir. Əksinə, onun qorxusu, ərəblərdən olan şərik qoşanlara və yaxud açıq-aşkar öz küfrünü nümayiş etdirən yəhudi, xristian, türk, hindli və başqa müşriklərə aiddir. Beləliklə, Allahın qullarına doğru yol göstərmək üçün nazil etdiyi ayələrdən sonuncular faydalana bilməzlər.

Əvvələn bunu deyə bilərik ki, İslam əsas tutan və müsəlman olduğunu deyən insanlar arasında möminlər də var, münafiqlər də. Münafiqlər Cəhənnəmin ən alt təbəqələrinə məxsusdurlar.

---

[59] Bu əsəri ərəbcədən türk dilinə çevirən sətiraltı qeydində yazır: “Bu kitabın (ərəb dilində olan) orijinal mətnində bu söz “nar” kimi verilsə də, bunun texniki yanlışlıq olduğunu hesab edərək, onu “nur” sözü ilə əvəz etdik. Çünki ayənin məzmunu və cümlənin tərtibi bunu tələb edir. Çev.”. Tərc. F.S.

[60] Fussilət, 41/5

[61] Bəqərə, 2/171

[62] Furqan, 25/44

[63] Əraf, 7/179

[64] Yunus, 10/12

Sonra da belə deyə bilərik ki, hər bir insanda iman olmaqla yanaşı küfr və ədavət hissinin olması mümkündür. Belə ki, Buxari və Müslimin yekdilliklə qəbul etdikləri bir hədisdə Peyğəmbər (s.ə.s.) belə buyurur:

***"Dörd xüsusiyyət, xasiyyət vardır ki, onlar kimdə olarsa, o əsil münafiq olar. Kimdə də o xüsusiyyətlərdən biri olarsa, o, həmin xüsusiyyəti tərk edənə qədər nifaqın bir ünsürünə malik olacaq. Danışanda yalan deyəcək, əmanətə xəyanət edəcək, söz verəndə sözündən qaçacaq və mübahisə etdikdə haqsızlıq edəcək"***[65]

Peyğəmbər (s.ə.s.), bu xislətlərdən birinin xas olduğu şəxsdə ədavətin bir ünsürünün olacağını xəbər vermişdir. Yenə bir səhih hədisdə olduğu kimi, Peyğəmbər (s.ə.s.) Əbu Zərə demişdir:

***"Sən səndə nadanlıq olan bir adamsan"***[66]

Halbuki Əbu Zər insanlardan ən doğru bir iman sahibi idi.

Digər bir səhih hədisdə deyilir:

***"Millətimin içində nadanlıqla bağlı dörd şey var ki, onları tərk edə bilməzlər***[67]***. (Bunlar:) Əsilli-nəsilli olmaqla öyünmək, nəsli söymək, ölü üçün vay-şivən qopar-maqla ağlamaq və ulduzlardan yağış istəmək"***[68]**.**

Yenə bir səhih hədisdə deyilir:

***"Siz özünüzdən əvvəlki millətlərin yoluna qarış-qarış, arşın-arşın və tamamilə qoşulacaqsınız. Əgər onlar kərtənkələ oyuğuna girsələr, siz də hökmən oraya girəcəksiniz".*** Biz: "Ey Allahın Elçisi, onlar yəhudilərlə xristiyanlardırmı?" – deyə soruşduq. Allahın Elçisi (s.ə.s.): ***"Onlardan başqa kim olacaq?*** – deyə buyurdu"[69]**.**

Bir başqa səhih hədisdə isə Peyğəmbər (s.ə.s.) buyurmuşdur:

***"Mənim millətim özlərindən əvvəlki millətlərin yolunu qarış-qarış, arşın-arşın təqib etmədikcə Qiyamət qopmayacaq".*** Səhabələrdən kimsə: "Allahın Elçisi, fars və Roma kimi millətlərimi?" – deyə soruşdu. Allahın Elçisi (s.ə.s.): ***"Onlardan başqa kim ola bilər ki?"*** – deyə buyurdu[70].

İbn Əbu Müleykənin: "Muhəmmədin (s.ə.s.) səhabələrindən olan otuz nəfərlə görüşdüm və hamısı da nifaqa düşəcəklərindən qorxurdular" dediyi rəvayət edilmişdir.

Əli (A.o.r.) və ya Hüzeyfədən (A.o.r.) rəvayət edilmişdir: "Qəlblər dörd cür olur: İçində işıqlı çıraq olan tərtəmiz qəlb. Bax bu möminin qəlbidir. Qılaflı qəlb. Bu isə kafirin qəlbidir. Tərsinə çevrilmiş qəlb. Bu münafiqin qəlbidir. İçində iki maddə olan qəlb; imanın yaratdığı maddə və nifaqın yaratdığı maddə. Bax bunlar xeyirxah əməlləri pis əməllərlə qarışdırmış insanlardır".

---

[65] Buxari, İman, hədis N 106

[66] Buxari, İman, 30; Müslim, hədis N 1661

[67] "Onları tərk edə bilməzlər" ifadəsi həm Müslimdə və həm də Əhməddə vardır. Hərçənd kitab halına salınmış hədislər şifahi rəvayət edildiyi üçün bu ifadə mətnə yazılmadığına görə, çevirən tərəfindən əlavə edilmişdir. Çev.

[68] Müslim, hədis N 924; Əhməd, 342, 343

[69] Buxari, 3456

[70] Buxari, hədis N 7319; Əhməd, 2/325

Bu izah edilənlər başa düşüləndə, Allahın imana aid olanları təriflədiyi və kafirliyə aid olanlara isə nifrət etdiyi şeylərdən hər bir qulun faydalana biləcəyi məlum olur. Amma bəzilərinin Allahın: **"Bizi doğru yola yönəlt"** ayəsi haqqında: "Mömin doğru yol göstərilmiş bir şəxsdir. Amma doğru yol istəməyin nə faydası var?" kimi sual verməlıərinə bəziləri belə cavab verirlər: "Burada doğru yolu istəməkdən məqsəd: "bizi hidayətdə möhkəmlət, daimiləşdir" deməkdir". Belə ki, bu hal bəzi ərəblərin yatan bir adama: "Yanına gələnə kimi yat" demələri kimidir. Bəziləri isə belə cavab verirlər: "Qəlbimizi doğru yola bağla, ondan ayırma" deməkdir ki, burada "Bizi doğru yola (hidayətə) yönəlt" ifadəsinin zəruri etdiyi qəlblər deyil, rədd edilmişlər qəlblər nəzərdə tutulmuşdur. Bir başqası isə, bu: "Hidayətimizi artır" deməkdir cavabını vermişdir.

Əslində belə bir sualın sual kimi verilməsi, Allahın qulunun ona hidayət verilməsini istədiyi doğru yolun nə olduğunu təsəvvür etməməsindən irəli gəlir. Burada "doğru yol (hidayət)" dedikdə, Allahın verdiyi hökmlərinə əməl etmək və bütün məsələlərdə qadağan etdiyi şeylərdən uzaq durmaq nəzərdə tutulur.

İnsan, Muhəmmədin Allahın Elçisi olduğunu və bir sözlə Quranın da haqq olduğunu qəbul etsə belə, ona fayda və zərər verə bilənlərin, yerinə yetirilməsi əmr edilən və qadağan olunan işlərdən ehtiyac duyduğu bir çoxunun təfərrüatını bilmir. Bildiklərinin bir çoxuna da əməl etmir. Tutaq ki, *insana* Quran və Sünnədəki bütün hökmlərin çatdığı fərz edilsə də, Quran və Sünnədə, başqa forması mümkün olmayan, hamı üçün ümumi meyarlar vardır. Çünki Allahın hər bir qulu üçün xüsusi hallar nəzərdə tutulmur. Buna görə də, belə hallarda insana doğru yola hidayət edilməsini istəməsi əmr olunmuşdur. Doğru yola yönəltmə aşağıdakı məsələlərin hamısını əhatə edir: Allahın Elçisinin *dinini* təfsilatı ilə bilmək, kütləvi məsələlərə aid olanları bilmək və bu biliklərə əməl etməsinin ona ilham yolu ilə verilməsi. Məsələ orasındadır ki, təkcə həqiqəti bilməklə (əgər bu özlüyündə *zəruri* əməli yaratmırsa) bir şey alınmırsa, bu o deməkdir ki, insan hələ hidayətə nail olmamışdır. Məhz bu səbəbə görə Hüdeybiyə müqaviləsindən sonra Allah Öz Peyğəmbərinə (s.ə.s.) belə buyurur:

**"Həqiqətən, Biz sənə aydın bir qələbə verdik ki, Allah sənin əvvəlki və günahlarını bağışlasın, sənə olan nemətini tamamlasın, səni düz yola yönəltsin"[71].**

Musa əleyhissalam və Harun əleyhissalam haqqında isə belə buyurulur:

**"Hər ikisinə aydın bir kitab verdik. Hər ikisini də doğru yola yönəltdik"[72].**

Müsəlmanlar Muhəmmədin (*peyğəmbərliyinin*) və Quranın gerçək (*Allahdan*) olduğuna inanmalarına baxmayaraq, Allahın bildirdiyi bir sıra xəbərlərdə, elmlə əlaqədar mövzularda və əməli məsələlərdə ziddiyyətə düşüb mübahisələr etmişlər. Əgər onların hər biri ixtilaf etdikləri barədə doğru yola yönəldilmiş olsaydı, qarşıdurmaya çıxmazdılar.

Sonra, Allahın hökmlərini bilənlərin əksəriyyəti Ona qarşı çıxır, bildiklərini həyata keçirməyə çalışmırlar. Əgər onlar bu əməlləri üçün doğru yola yönəldilsəydilər, onlara əmr ediləni yerinə yetirər və qadağan olunanlardan uzaqlaşardılar. Bu millətin*,

---

[71] Fəth, 48/1-2
[72] Saffat, 37/117-118
* Müsəlman ümməti (milləti) nəzərdə tutulur. F.S.

Allahın hidayətə yetişdirməsi nəticəsində onun müttəqi dostlarından olan *nümayəndələrinin məhz bu dərəcəyə* yetişmələrinin ən böyük səbəbi hər namazda Allaha yalvarıb dua etmələridir. Onlar, Allahın onları doğru yola yönəltməsinə möhtac olduqlarını bildikləri üçün *namazlarında* daima dua edirlər. Bu duanı daima təkrarlayaraq, onun kifayət etmədiyini həmişə düşünməklə onlar Allahın müttəqi dostlarından olmuşlar.

Səhl b. Abdullah ət-Tüstəri deyir: "Qul ilə Rəbbi arasındakı ən yaxın yol – möhtac olmaqdır". Əgər insan keçmişdə hidayət olunmuşsa, o, gələcəkdə də hidayətə (*ona doğru yol göstərilməsinə*) möhtacdır. Bax, bu nəzər nöqtəsi: "Bizi möhkəm et, bizi doğru yola sarılmağa yönəlt" deyən şəxslərin sözünün həqiqətidir.

"Hidayətimizi artır" deyənlərin sözü yuxarıda izah edilənlərin əhatəsinə daxildir. Lakin bunların hamısı gələcəkdə doğru yola hidayəti (*yönəldilməyi*) ifadə edir. Halbuki, gələcəkdə elmə əməl etmək hələ həyata keçirilməmişdir. Bəlkə heç sonra elm gerçəkləşmədi. Bəlkə, elm yaransa da, sonradan qəlbdən getdi. Belə olduqda əməl də gerçəkləşməmiş qalar. Buna görə, bütün insanlar bu duanı etməyə məcburdur. Elə bu səbəbdən ötrü Allah insanlara bu qaydada dua etməyi hər namazda fərz etmişdir. Bəli, insanlar üçün bu duadan[*] daha vacib bir şey yoxdur. İnsan doğru yola hidayət edildikdə (*yönəldildikdə*), onun üçün yardım, ruzi və ürəyinin istədiyi bütün səadət yolları açılır. Ən yaxşısını bilən Allahdır!

## QƏLBİN HƏYATI, CANLI OLMASI

Onu da bilmək lazımdır ki, qəlbin canlı olması və ya başqa şeylərin canlılığı olsun, təkcə hiss etmək və ya istəyə uyğun olaraq davranmaqdan ibarət deyil. Əbu Hüseyn əl-Bəsri kimi bəzi mütəfəkkirlərin: "Allahın elmi və qüdrəti təkcə bilmək və qüdrətdən ibarətdir" deyə zənn etdiyi kimi həyat təkcə bilməkdən ibarət deyil. Bu mütəfəkkirlər belə deyirlər: "Allahın həyatı Onun bilməsindən və qadir olmasından ibarətdir".

Əksinə, həyat onunla vəsf edilən şeyin mövcudluğu keyfiyyətidir. Həyat – elm, iradə və şüurlu hərəkətlər etməyə qadir olmanın dəlilidir. O, bunları eyni zamanda zəruriləşdirir. Belə olduqda, hər bir canlı şüuru, iradəsi və qüvvəsi ilə istədiyi əməli yerinə yetirə bilir. Elmi, iradəsi olan və sərbəst hərəkət edə bilən hər şey canlıdır.

"Həya" sözü də həyatdan törəmədir. Bu minvalla, sahibini diri edən bir qəlbdə onu çirkin əməllərdən uzaqlaşdıran bir həya da vardır. Çünki qəlbin həyatı, onu pozğunlaşdıran çirkin işlərdən uzaqlaşdırmanın şəxsən özüdür. Buna görə Peyğəmbər (s.ə.s.) belə buyurmuşdur:

***"Həya imandandır"*[73].**

Yenə də:

---

[*] Namazda oxunan "Fatihə" surəsi (o cümlədən, 6-7-ci ayələr) nəzərdə tutulur. F.S.

[73] Buxari, İman, 24; Müslim, hədis N 59

*“Həya və az danışma imanın iki bölməsidir. Çirkinlik və çox danışmaq isə nifaqın iki bölməsidir”*[74]

Diri, həyatdan məhrum edilmiş ölüdən fərqli olaraq, ona əziyyət verən şeyləri özündən qovub uzaqlaşdırır. Buna görə də ölüyə ciddi və qəti mənada “quru”[*] deyilir. Bu, nəmliyin əksi olan quruluğu bildirir. Ölü quru, bərk və möhkəm olduğuna görə onun qəlbində həyanı və çirkinliklərdən çəkinməyi zəruri edəcək bir canlılıq olmur. O, eynilə, ayaq basarkən üstündə iz qalmayan yer kimidir. Yaşıllıq içində olan yer isə belə deyil. Məhz buna görə həyalı olan bir insanın çirkin şeydən təsirləndiyi onun çöhrəsindən məlum olur. Onun özünü natəmiz işlərdən çəkindirəcək bir iradəsi vardır. Abırsız ölünün və həyasız bir adamın canı da olmaz, onu çirkinliklərdən saxlayacaq imanı da olmaz. Elə isə, qəlb canlı olduğu halda insan, ruhunun bədənindən ayrılması nəticəsində ölərsə də, nəfsin bədəndən ayrılması ilə ölməsi, hələ həyatın ondan yox olması mənasında ölü deyil. Buna görə Uca Allah buyurur:

**“Allah yolunda ölənlərə: “Ölüdürlər!” deməyin. Əksinə, *onlar* diridirlər, lakin siz *bunu* ayırd edə bilmirsiniz”[75].**

**“Allahın yolunda öldürülənləri əsla ölmüş sanma. Əksinə, *onlar* diridirlər; özlərinin Rəbbi yanında onlara ruzi verilir”[76].**

Bununla yanaşı onlar Allahın aşağıdakı ayələrinin nəzərdə tutduğu ölülərdir:

**“Hər bir kəs ölümü dadacaqdır”[77].**

**“Əslində, sən də öləcəksən, onlar da öləcəklər!”[78].**

**“Sizə həyat verən, sonra öldürəcək, daha sonra diriləcək məhz Odur...”[79].**

Varlığı qəbul edilən ölüm, olmadığı *haqqında* söylənən ölüm deyildir. Varlığı bildirilən ölüm – ruhun bədəndən ayrılmasıdır. Olmadığı söylənən ölüm isə, həyatın bədən və ruhdan tamamilə yox olmasıdır. Bu, eynilə: “yuxu ölümün qardaşıdır” ifadəsinə bənzəyir. Çünki yuxu həm ölüm və həm də vəfat kimi adlandırılmışdır, amma hər ikisində də həyat vardır.

Uca Allah belə buyurur:

**“Allah ölənlərin canını ölüm anında, ölməyənlərin canını isə onlar yuxuda ikən alır. Ölümünə hökm verdiyi kəsin canını saxlayır, digərini isə müəyyən olunmuş vaxtadək buraxır...”[80].**

Peyğəmbər (s.ə.s.) yuxusundan oyanan kimi:

***“Ölümümüzdən sonra bizi diriləndən Allaha həmd olsun! Yenidən diriltmək də Ona aiddir”[81].***

---

[74] Tirmizi, “Birr və Sıla”, 2096
[*] Yəni, nəmliyi, nəmişliyi olmayan, qupquru. F.S.
[75] Bəqərə, 2/154
[76] Ali-İmran, 3/169
[77] Ali-İmran, 3/185
[78] Zumər, 39/30
[79] Həcc, 22/66
[80] Zumər, 39/42

Bir başqa hədisdə isə:

***"Ruhumu mənə geri qaytaran, bədəncə məni sağlam yaradan, Onu düşünməyimə izin verən və yaratdıqlarının bir çoxundan üstün edən Allaha həmd olsun!"***[82] – demişdir.

Yatağına girəndə də:

***"Allahım! Nəfsimi yaradan Sənsən, onu öldürən də Sən olacaqsan. Ölümüm də, həyatım da Sənə məxsusdur. Əgər nəfsimi saxlayıb geri buraxmasan, ona rəhm et. Yox, əgər yenidən dünyaya qaytarsan, əməlisaleh qullarını qoruduğun kimi, onu da qoru"***[83]**.**

***"Ey Allahım! Sənin adınla ölür və dirilirəm"***[84] – deyə dua edərdi.

---

[81] Buxari, hədis N 6312; Müs
[82] Kənzul-ummal, 21418
[83] Buxari, hədis N 7393; Tirmizi, 240; Əhməd, 2/246
[84] Müslim, hədis N 2711.

# QƏLBİN XƏSTƏLİKLƏRİNDƏN BİRİ DƏ HƏSƏDDİR

Bəziləri həsədə tərif verərkən belə deyiblər: "Varlıların həyatının təmtaraqlı olduğunu bildiklərinə görə yaranan işgəncədir". Bu təyinə görə, xeyirxah olan bir insan həsəd çəkən olmaz. Xeyirxah insanlar xoşrəftar olarlar. İnsanların bir qrupu isə belə deyib: "Həsəd - həsədi çəkilənə məxsus nemətin, o, həsəd çəkənə çatmasa da, yox olmasını istəmək deməkdir". Bu, qibtənin əksinə olan bir haldır. Çünki qibtə* edilərkən qibtə edilən şəxsə məxsus nemətin yox olmasının arzu edilməsi yoxdur. Əslində, həsəd nifrət etmək və həsədi çəkilənin xoşbəxtliyindən xoşlanmamaq deməkdir.

### Həsəd iki cürdür

Birincisi, bir şəxsə məxsus olan nemətdən qətiyyətlə xoşlanmamaqdır. Bax, pislənən həsəd budur. Həsəd çəkən belə halda əsəbiləşdiyi şeyi həsədini çəkdiyi şəxsdə görməsi onu kədərləndirir və əziyyətə salır. Bu isə onun qəlbində bir xəstəliyə səbəb olur və o nemətin yox olmasının ona heç bir fayda merməməsinə baxmayaraq, onun həmin şəxsdən yox olmasından həzz alır və rahatlıq duyur. Halbuki onun xeyrinə ola biləcək şey, qəlbində hiss etdiyi ağrının yox olmasıdır. Lakin bu acı-ağrılar onun belə vəziyyət müqabilində rahatlıq tapması ilə gedərdi. Bu vəziyyətdən daha çətin olan hal isə, xəstəlik sağaldığı halda qəbul edilən narkotik (*sakitləşdirici*) maddələrin qəbulunun davam etdirilməsidir. Allahın quluna verdiyi nemətdən ötrü ona hirslənmək bir xəstəlikdir. Çünki belə olduğu halda, bu nemət bəlkə yenə həsədi çəkilənə qayıdar və ya daha da artıqlaması ilə qayıdar*. Bu nemət, həsədi çəkilənə bənzər başqa bir insana verilər. Axı həsəd çəkənin aydın bir məqsədi də yoxdur. Təkcə başqalarına verilən nemətdən xoşlanmır. Məhz buna görə bir adam demişdir: "Həsəd – nemətin yox olmasını istəməkdir. Çünki başqasının əldə etdiyi nemətdən xoşlanmamaq, qəlbin onun yox olmasını arzu etməsindən doğur".

İkincisi, bir adamın özündən ləyaqətlisindən, üstün olandan xoşlanmamasıdır. Buna görə o, özünün *həsədini çəkdiyindən* daha da üstün olmasını arzulayar. Bu, qibtə adıyla da adlandırılan həsəddir. İbn Məsud və İbn Ömər (Allah onlardan razı olsun) Peyğəmbərdən (s.ə.s.) eynilə rəvayət etdikləri bir hədisdə buna qibtə deyilir:

***"Həsəd ancaq aşağıdakı iki nəfərə edilə bilər: onlardan biri Allahın ona verdiyi elmlə idarə edər və onu başqalarına öyrədər, digəri isə, Allahın ona verdiyi malı haqq yolunda sərf edər"[85].*** Bu İbn Məsudun dediyidir.

---

* Qibtə formaca həsədə bənzəsə də, mahiyyətcə ondan tamamilə fərqlənir. Qibtə, gördüyün adamdakı nemətdən müsbət təsirlənmək və xoşhallanmaqdır. Bu zaman insan vəcdə gəlir və qibtə obyektinə qarşı hörmət, ehtiram, məhəbbət, qayğı və s. xeyirxah hisslər bəsləyir. F.S.

* Bu isə o deməkdir ki, Uca Allah həsəd çəkənin həsədini, xəstəliyini daha da artırar, onu daha da zəlil günə qoyar, həmin və digər nemətlərə möhtac edər.

85 Buxari, Elm, 73; Müslim, hədis N 816

İbn Ömər isə aşağıdakı sözlərlə rəvayət edir: "Bir nəfər Allahın ona verdiyi Quran ilə gecə-gündüz məşğul olan şəxs, digəri isə Allahın ona verdiyi malı gecə-gündüz haqq yolda xərcləyən şəxsdir"[86].

Buxari Əbu Hüreyrədən bu sözlərlə rəvayət edir:

"İki adam vardır ki, onlardan başqasına həsəd çəkilməz: biri Allahın ona verdiyi Quranı gecə-gündüz oxuyan adamdır, o biri də onu dinləyib: "Kaş ki, ona verilən, mənə də veriləydi və mən də onun kimi edəydim" deyəndir". Bir başqası isə deyir ki: "Kaş ki, ona verilən mənə də veriləydi və mən də eynilə onun etdiyi kimi edəydim"[87].

Peyğəmbər (s.ə.s.) bax bu iki halda edilən həsəddən başqa həsəd çəkməyi qadağan etmişdir. O (s.ə.s.) bu həsədi qibtə adlandırmışdır. Qibtə - başqası kimi olmaq, onun özündən üstünlüyünü yaxşı qarşılamamaqdır.

Əgər deyilsə ki, madam belədirsə, onda niyə bu həsəd adlandırılmışdır? Axı o adam Allahın ona nemət verməsindən başqa bir şey istəmir ki?

Bu suala belə cavab verilir. Bu arzulamanın başlanğıcı Allahın bir başqasına nemət verməsinə baxması və onun özündən üstün olmasından xoşlanmaması ilə bağlıdır. Əgər bu başqa şəxs olmasaydı, o adam bu neməti arzulamayacaqdı. Madam ki, başqasının özündən üstün olmasını xoşlamır, deməli bu, həsəddir. Çünki istək xoşa gəlməyən bir şeyin ardıyca yaranmışdır. Lakin insanların halına heç bir münasibət bildirmədən, Allahdan özünə nemət verilməsini istəməkdə həsədə aid bir xüsusiyyət yoxdur. Bu səbəbə görə də insanların əksəriyyəti bu ikinci qisimlə xəstələnirlər. Bəzən buna "rəqabət (yarış)" adı verilir. İki nəfərin qələbə çalmaq istədikləri xoşagələn və arzu edilən bir işdə yarışması kimi. Burada, iki yarışanın hər biri o birisinin onu ötməsini xoşlamadığı kimi, digəri də bu birisinin onu ötməsini xoşlamayacaq.

Belə yarış mütləq mənada pis bir şey deyil. Əksinə, xeyirli məsələlərdə, hətta tərifə də layiqdir. Uca Allah buyurur:

**"Həqiqətən, itaətkarlar nemətlər içində olacaqlar. Onlar taxtlar üstündə seyrə dalacaqlar. Sən onların çöhrəsində səadət parlaqlığı görəcəksən. Onlara möhürlü şərabdan içirdiləcəkdir. Onun möhürü müşkdür. Qoy çalışanlar onun üçün səy göstərsinlər!"**[88]

Yarışa girənə məhz bu nemətlər üçün yarışmağa səy göstərməsi buyurulmuşdur və onun ötüb keçən dünyanın nemətlərinə görə yarış aparılmır. Bu müddəa Peyğəmbərin (s.ə.s.) hədisinə uyğundur. Çünki o (s.ə.s.), iki nəfərdən başqa, digərlərinə həsəd çəkilməsini qadağan etmişdir. Bunlar – elm verilən və onu tətbiq edərək, həm də başqasına öyrədən və var-dövlət verilən və onu haqq yolunda xərcləyən şəxslərdir. Lakin elm verildiyi halda onu tətbiq etməyən və başqasına öyrətməyən, var-dövlət verildiyi halda onu Allah yolunda xərcləməyən şəxslərə həsəd çəkilməz və onların

---

[86] Buxari, hədis N 8529; Müslim, hədis N 815
[87] Buxari, hədis N 7232
[88] Mutaffifin, 83/22-26

vəziyyətinə düşmək heç kimə arzu olunmaz. Çünki bu, arzu edilməli olan bir xeyir deyil, əksinə əzaba düşməkdir*.

İdarəetmə səlahiyyəti olan insan vəzifəsini elmə əsaslanaraq ədalətlə yerinə yetirərsə, əmanəti sahibinə çatdırarsa və insanlar arasında Quran və Sünnəyə müvafiq qərar qəbul edərsə, dərəcəsi çox yüksələr. Çünki, belə olduqda, o, Allah yolunda mübarizə aparan bir şəxs kimi çox böyük bir cihad etmiş sayılır. Mənliyini qorumaq istəyənlər isə böyük sıxıntılar içində olan insanlara həsəd aparmazlar. Allah yolunda cihad edənin dərəcəsi malını xərcləyənin dərəcəsindən nə qədər üstün olsa da, cihada məxsus olan çətinliklərə və məşəqqətlərə görə, o, nəzərdə tutulmamışdır**. Malını sərf edən və insanlara biliyini öyrədən insanlar isə belə deyil. Çünki adi halda bu iki nəfərin məlum bir düşməni yoxdur. Əgər onların özlərindən kənarda mübarizə apardıqları bir düşmənlərinin olduğu qəbul edilərsə, bu onlar üçün ən üstün cihad dərəcəsi sayılardı. Peyğəmbər (s.ə.s.) namaz qılanı, oruc tutanı və həcc ziyarətinə gedəni də nəzərdə tutmamışdır. Çünki bu əməllər***, Allah yolunda malını sərf etmə və bildiyini başqasına öyrətməkdə olduğu kimi deyil; adi halda insanların özləri üçün qazandıqları faydadan başqa, onun onlara, xoş gələcək bir faydası olmayacaqdır.

Həsəd, əslində, başqalarına hakimiyyət və öndərlik verən şeylərə doğru yönəldilir. Adi hallarda işləyən bir adama, yeməsi, içməsi və evlənməsi baxımından, nə qədər çox yararlanmış olsa da, həsəd çəkməzlər. Lakin bu, o iki növ əmələ aid deyildir, onların sahiblərinə həsəd çəkilir. Buna görə, elm sahibləri arasında, onların ardıyca gedənlərin həsədi, belə olmayanlarda yoxdur. Eynilə var-dövlətini Allah yolunda sərf edənlərin tərəfdarları olanlar da bu qəbildəndir. Nəticə etibarı ilə, alim, insanlara qəlbinin qidası ilə fayda verirsə, malını sərf edən də bədəninin qidası ilə fayda verir. Bütün insanlar həm bundan və həm də ondan özlərinə xeyir verən şeylərə daima möhtac olurlar. Elə bu səbəbdən də Uca Allah həm buna və həm də ona dair iki məsəl çəkir:

**“Allah, heç bir şeyə gücü çatmayan və başqasının malı olan bir kölə ilə, dərgahımızdan özünə verdiyimiz gözəl ruzidən gizli və aşkar xərcləyən kimsəni misal çəkdi. Heç onlar eyni ola bilərmi? Həmd Allaha məxsusdur, lakin onların çoxu bunu bilmir. Allah eləcə də iki kişi barəsində məsəl çəkdi: onlardan biri laldır, heç bir şeyə çatmır və öz ağasına bir yükdür. Onu hara yollasa, xeyirlə qayıtmaz. Məgər doğru yolda olub ədalətli işlər görməyi əmr edən bir kimsə ilə belə bir adam eyni ola bilərmi?”**[89]

Uca Allah bu iki məsəli Onun Müqəddəs Zatını unudub, Ondan başqasına ibadət edilənlərə dair çəkmişdir. Bütlər həqiqətən də faydalı bir iş görməyə, faydalı bir söz deməyə qadir deyillər. Gəlin, heç bir şeyə gücü çatmayan bir kölə ilə, Allahın gözəl bir tərzdə ruziləndirdiyi insan haqqında düşünək! Məgər kiməsə bir yaxşılıq etməkdə aciz olan bir kölə ilə, aşkarda və gizlində insanlara xeyirxahlıq edən bir adam eyni ola bilərmi?

---

* Yəni, belə insanlara həsəd çəkənlər özlərini əzaba salmış olarlar. F.S.
** Yəni cihad edənə həsəd çəkmək yol verilən davranış kimi sayılmamışdır. F.S.
*** Yəni, namaz, oruc və həcc ziyarəti. F.S.
[89] Nəhl, 16/75-76

Uca Allah qullarına lütfkarlıq göstərməyə qadir olandır və O, heç vaxt onlardan mərhəmətini əsirgəmir. Belə olduğu halda, necə ola bilər ki, heç nəyə gücü çatmayan aciz bir kölə Allaha bənzədilsin və Ona şərik edilsin?

Bax bu, Allahın var-dövlət verdiyi və onu gecə-gündüz (Allah yolunda) xərcləyənə aid məsəldir.

İkinci məsəldə isə, iki şəxsi nəzərdə tutaq. Bunlardan biri ağılsız, danışa bilməyən və heç bir şeyə gücü çatmayan bir lal-dilsizdir. Belə bir adam bu halda olması ilə bərabər hələ ağasına da bir yükdür. Ağasının onu göndərdiyi yerdən heç vaxt xeyirlə qayıtmaz. Beləliklə, gördüyümüz kimi, onun heç bir faydası yoxdur. O biri şəxs isə alim, adil, ədalətlə iş görən və beləcə doğru yolda olan bir adamdır. Bax bu, Allahın ona hikmət verdiyi və bu hikmətə uyğun şəkildə əməl edən və onu insanlara öyrədən şəxsə aid məsəldir.

Uca Allah bunu Özünə aid bir məsəl kimi bildirmişdir. Çünki Uca Allah – Alimdir, Qadirdir və Ədalətlə Hökm Verəndir. O, doğru yolun Ədalətli Olanıdır. Beləliklə, Uca Allah buyurur:

**"Allah Özündən başqa tanrının olmadığına şahidlik etdi, mələklər və elm sahibləri də *şahidlik etdilər. Allah əbədi olaraq* ədalətli olmaqdadır. Ondan başqa ilah toxdur, Qüdrətlidir, Müdrikdir"[90].**

Hud əleyhissalamın diliylə Uca Allah belə buyurmuşdur:

**"...Həqiqətən, Rəbbim ədalətlidir"[91].**

Buna görə də, Abbasın (A.o.r.) evinə ehtiram göstərirdilər. Abbas (A.o.r.) insanlara elm öyrədir, qardaşı isə onları yedizdirirdi. Buna görə də onlara hörmət bəslənilirdi. Muaviyə, adamların "hacı" adını almaq üçün Kəəbəni ziyarət etməyin qaydaları haqqında İbn Ömərdən soruşduqda və onun da onlara fitva verdiyini gördükdə: "Allaha and olsun, bu şərəflidir" və ya buna oxşar bir söz dedi.

## Əbu Bəkr ilə Ömər (Allah onlardan razı olsun) arasında rəqabət

Ömər b. Xəttabdan (A.o.r.) rəvayət edildiyinə görə, Ömər Əbu Bəkr ilə Allah yolunda öz malını sərf etmək üzrə yarışar və rəqabət aparardılar. Ömər (A.o.r.) belə deyir:

"Allahın Elçisi (s.ə.s.) sədəqə verməyimizə əmr vermişdi, bu da mənim var-dövlətdən bol olduğum bir vaxta təsadüf edirdi. Mən isə öz-özümə: "Xeyirxahlıq yolunda Əbu Bəkri keçəcəyəmsə, məhz bu gün onu etməliyəm" dedim və malımın yarısını Allahın Elçisinin (s.ə.s.) yanına apardım. Allahın Elçisi (s.ə.s.) məndən: ***"Ailən üçün nə saxladın?"*** deyə soruşdu. Mən də: "Eyni miqdarda onlar üçün saxladım" dedim. Əbu Bəkr malının hamısını gətirdi. Allahın Elçisi (s.ə.s.) Əbu Bəkrdən: ***"Ailən***

---

[90] Ali İmran, 3/18
[91] Hud, 11/56

***üçün nə saxladın?"*** soruşan kimi, o: "Onlara Allahı və Onun Elçisini saxladım" cavabını verdi. O zaman mən ona: "Mən səninlə bir də heç vaxt yarışa girməyəcəyəm" dedim"[92].

Ömərin (A.o.r.) yarışla bağlı etdiyi hərəkət savabı və günahı olmayan bir qibtədir. Lakin burada Əbu Bəkr Sıddıq (A.o.r.) ondan daha üstündür. O, rəqabətdən tamamilə uzaq, bu barədə özünü kimlə isə müqayisə etməyən insandır. Merac hadisəsində Musa əleyhissalamın vəziyyəti də eynilə bu cürdür. O da Peyğəmbərə (s.ə.s.) rəqabət hissi ilə yanaşır. Hətta Peyğəmbərimiz (s.ə.s.) onu ötüb keçəndə, o ağlayır. Ondan: "Sən niyə ağlayırsan?" soruşanda, deyir ki: ***"Ona görə ağlayıram ki, məndən sonra peyğəmbər göndərilən gəncin Cənnətə girəcək ümməti, mənim ümmətimdən Cənnətə girənlərdən daha çox olacaq"[93].***

Bu hədisin "Səhiheyn"-dən başqa rəvayətlərində aşağıdakı ifadələr nəql edilmişdir:

***"Biz "ehtiramla qəbul olundun və üstün tutuldun" deyə, ucadan danışan bir adamın yanına çatdıq. Ona yetişən kimi salam verdik və salamımıza cavab olaraq belə dedi: "Bu yanındakı kimdir, ey Cəbrail?" Cəbrail əleyhissalam: "O, Əhməddir!" dedi. Həmin adam: "Salam olsun, ey Rəbbinin dinini təbliğ edən, ümmətinə nəsihət verən yazı-pozu bilməyən peyğəmbər!" dedi.*** *Peyğəmbər* (s.ə.s.) *sözünə davam edərək dedi ki:* ***"Sonra biz ondan ötüb keçincə, mən: "Bu adam kim idi, ey Cəbrail?" dedim. O: "Bu, İmran oğlu Musadır" dedi. Mən: "Bəs kimi qınayır?" dedim. O: "Sənə görə Rəbbini qınayır" dedi. Mən: "Rəbbinin üstünəmi səsini qaldırır?" dedim. Cəbrail: "Həqiqətən, Rəbbi onun doğruçuluğunu bilir" dedi"[94]***

Ömər (A.o.r.) (Əbu Bəkrə qibtə etməsi barədə) Musa əleyhissalama bənzəyir. Peyğəmbərimizin (s.ə.s.) vəziyyəti Musanın (ə.) vəziyyətindən daha üstündür. Çünki onda qibtə ediləsi hal yoxdur.

Eyni vəziyyət səhabələr arasında – Əbu Ubeydə b. Cərrah ilə başqalarında da var idi. Onlar bütün bunlardan artıq xilas olmuş, nə günah, nə də savabı olmasa belə, qibtə etməkdə və xeyirxah işlərdə yarışmaya çıxanlardan daha yüksək mövqe tutmuşdular. Məhz buna görə, Əbu Ubeydə haqlı olaraq "Ümmətin Əmini" adını qazanmışdı. Həqiqətən də inanılan insan, ona əmin olana qarşı daxilən bir rəqiblik hissi bəsləmədiyindən, əmanət məsələsində qadınlara, uşaqlara və var-dövlətə qarşı səbatsız olandan, əmanət saxlamaqda daha çox haqq sahibidir. Böyük bir idarəni idarə etmək arzusunda olmayan bir adam kimi tanınana kiçik bir idarə əmanət verilir. Var-dövlətə həris olmadığı məlum olan adama var-dövlət əmanət edilir. Daxilən xəyanətkar olan bir adama əmanət verilməsi qoyunları qurda əmanət kimi verməyə bənzəyər. Beləsi, əmanət edilən şeyə bəslədiyi istəyinə görə əmanətə xəyanət edər.

İmam Əhməd "Müsnəd"ində Ənəsdən (A.o.r.) rəvayət etdiyi bir hədisdə belə deyir:

"Biz bir dəfə Allahın Elçisinin (s.ə.s.) yanında oturmuşduq. Allahın Elçisi (s.ə.s.) buyurdu: ***"İndi sizin yanınıza bu yoldan Cənnət əhli olan bir adam gələcəkdir".*** Ənəs:

[92] Tirmizi, 3675; Əbu Davud, 1678; Darimi, 1667
[93] Buxari, hədis N 3887; Müslim, hədis N 264
[94] Suyuti, "Dürrül-Mənsur", 4/147

“O bunu deyən kimi, saqqalından dəstəmaz suyu damcılayan, ayaqqabılarını sol çiynindən asmış halda ənsarlardan bir nəfər gəlib çıxdı. Salam verdi. Səhər açılınca Allahın Elçisi (s.ə.s.) yeni həmin sözləri dedi. Bu adam da yenə eyni vəziyyətdə gəldi. Üçüncü gün Allahın Elçisi (s.ə.s.) bir də o sözləri təkrar etdi. Bu adam da əvvəlkilərin vəziyyətində idi.

Allahın Elçisi (s.ə.s.) yerindən qalxan kimi, Abdullah b. Amr b. As (A.o.r.) o adamın ardıyca gedərək, ona: “Mən atamla mərc gəlmişəm və üç gün evə gəlməyəcəyimə dair and içmişəm. Əgər yanın qalmağımı münasib görsəydin, bu üç gün gecəni sənin yanında qalardım” dedi. Həmin adam: “Olar” dedi.

Ənəs (A.o.r.) deyir ki: “Abdullah üç gecə onun yanında qalmasını belə danışırdı: Üç gecə yanında qaldım. Onun gecələr qalxıb namaz qıldığını görmədim. O ancaq gecə oyanıb yatağında çevrilən kimi Allahı anıb təkbir deyirdi və bunu sübh namazına qalxana qədər davam etdirərdi.

Abdullah deyir ki, mən o adamdan, xeyirdən başqa bir söz eşitmədim. Üç gün tamam olan kimi, mən az qala onun bu əməlini acılayacaqdım. Dedim ki, “ey Allahın qulu, mənim atamla aramızda hər hansı bir anlaşılmazlıq və susqunluq söhbəti olmayıb. Lakin mən Allahın Elçisinin (s.ə.s.) üç dəfə: ***“Sizin yanınıza Cənnət əhli olan bir nəfər gələcək”*** dediyini eşitmişəm və hər üç dəfə də sən gəlib çıxırdın. Mən də sənin yanında qalıb, nə etdiyini görmək və o əməlini sənin kimi yerinə yetirməyim üçün belə etdim. Lakin mən sənin hər hansı bir işlə məşğul olduğunu görmədim. Səni Allahın Elçisinin (s.ə.s.) dediyi mövqeyə yüksəldən nədir?”

Həmin şəxs: “Necə görmüşsən, belə də var. Ancaq mən müsəlmanlardan heç kimə qarşı daxilimdə aldatmaya, hiyləyə yol vermirəm və Allahın ona verdiyi bir xeyirdən ötrü on həsəd çəkmirəm” dedi. Abdullah isə ona belə cavab verdi: “Səni o məqama yüksəldən, bizim isə edə bilmədiyimiz şey də məhz budur”[95]. Allah ənsarları təriflәyərək belə buyurur:

**“...onlara verdiklərinə görə qəlblərində peşmançılıq hissi duymurlar. Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar. Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır”[96].**

Yəni, mühacir qardaşlarına verdiklərinə görə daxilən bir narahatçılıq keçirmirlər. Müfəssirlər deyirlər ki, “Onlar mühacirlərə verilənlərə görə kökslərində bir ehtiyac, yəni həsəd yaranmır”. Daha sonra, bəziləri: “Qənimət malından verilənlərə görə” deyiblər. Belə də deyilmişdir: “Fəzilət və qabaqcıllığa görə”. Yəni, ənsarlar onlara, istər var-dövlət olsun, istərsə də vəzifə olsun, verilənlərə görə heç bir narahatçılıq, ehtiyac hissi keçirməzdilər. Adətən, həsəd bələ şeylərə yönəlir. Həzrəc və Evs qəbilələri arasında dinə görə bir rəqabət vardı. Onlardan bir nəfər Allah və Onun Elçisinin (s.ə.s.) yanında üstün olacaqları bir işi gördükdə, digəri də onu eynilə yerinə yetirmək istəyərdi. Bu, onları Allaha yaxınlaşdıran yarış idi.

Beləliklə, Uca Allah buyurur:

[95] Əhməd, 3/166
[96] Həşr, 59/9

**"...Qoy çalışanlar onun üçün səy göstərsinlər!"**[97]

## Qətiyyətlə qınanan və pislənən həsəd

Tamamilə qınanan və pislənən həsəd Uca Allahın yəhudilər barəsində buyurduğu həsəddir:

**"Kitab əhlindən bir çoxu həqiqəti bildikdən sonra da, paxıllıqları üzündən sizi, siz iman gətirdikdən sonra kafirliyə qaytarmaq istəyərlər..."[98].**

Ayədə keçən "istəyərlər" *sözü* arzu edərlər deməkdir. Yəni:

Sizə çəkdikləri həsədə görə sizin dininizdən dönməyinizi istəyər, arzu edərlər. Burada həqiqət onlara izah edildikdən sonra bu istək və arzunu zəruri edənin həsəd olduğu bildirilmişdir. Çünki yəhudilər sizə aid olan nemətlərdən əmələ gələnləri görən kimi, bilavasitə sizdə olduğu halda onlarda oxşarı olmayan nemətlərə həsəd çəkməyə başladılar. Eyni məsələ başqa ayələrdə aşağıdakı kimidir:

**"Yoxsa onlar Allahın Öz lütfündən onlara verdiyi şeyə görə onlara həsəd aparırlar? Biz İbrahimin nəslinə də Kitab və hikmət bəxş etmiş və onlara böyük bir səltənət vermişdik. Onlardan kimi (*Muhəmmədə*) iman gətirdi, kimi də ondan üz çevirdi. Yandırıb-yaxan od kimi Cəhənnəm onlara bəsdir"[99].**

**"De: "Sığınıram sübhün Rəbbinə! Məxluqatının şərindən, çökən zülmətin şərindən, düyünlərə üfürən *cadugər* qadınların şərindən və həsəd aparan zaman paxılın şərindən!"[100]**

Təfsirçilərin bir hissəsi bu surənin nazil edilmə səbəbini Peyğəmbərimizə (s.ə.s.) həsəd çəkən yəhudilərdən olan Ləbid b. Asamın ona (s.ə.s.) cadu etməsi ilə əlaqələndidirlər.

Deməli, Allahın ona (s.ə.s.) bəxş etdiyi nemətə nifrət bəsləyən həsəd çəkən zalım və həddini aşan bir adamdır. Allahın başqasına etdiyi yaxşılığı gözü götürməyən və o yaxşılığı özü üçün istəyən kəsə bu *əməl* qadağan edilmişdir. Ancaq Allaha yaxınlaşmaq üçün edilən əməllər istisnadır.

Əgər bu adam, Allaha yaxınlaşdırmaq üçün bir başqasına verilən nemətlərdən özü üçün istəməsində qınanılası bir şey yoxdur. Lakin insan başqasına fikir verməkdənsə, öz qəlbini düzəltməsi daha xeyirlidir. Sonra, belə həsəd çəkən adam, hələ onun tövbə etməsi bir yana qalsın, həsədlə bağlı işə əməl edərsə, o zalım, həddini aşmış və özünü əzaba düçar etmiş olur.

Həsədi çəkilən insan isə səbirli və ürəyində Allah qorxusu olan məzlumdur. Bu minvalla o, həsəd çəkənin əziyyətinə səbr edərək, əhəmiyyət vermədən ondan uzaqlaşmalıdır.

---

[97] Mutaffifin, 83/26
[98] Bəqərə, 2/109
[99] Nisa, 4/54-55
[100] Fələq, 113/1-5

Beləliklə, Uca Allah bu barədə belə buyurur:

**"Kitab əhlindən bir çoxu həqiqəti bildikdən sonra da, paxıllıqları üzündən sizi, siz iman gətirdikdən sonra kafirliyə qaytarmaq istəyərlər. Allah Öz əmri ilə gəlincəyə qədər *onları* bağışlayın və *onlara* baş qoşmayın. Həqiqətən, Allah hər şeyə qadirdir"[101].**

Deyilənlərə görə, Yusuf da qardaşlarının həsədinə tuş gəlmişdi.

**"Bir vaxt *onun qardaşları* dedilər: "Biz bütöv bir dəstə olmağımıza baxmayaraq Yusuf və onun *doğma* qardaşı atamıza bizdən daha sevimlidir. Aydın görünür ki, atamız aşkar bir yanlışlıq içindədir"[102].**

Atasının onları belə üstün tutmasına görə onların hər ikisinə həsəd aparırdılar. Buna görə Yaqub Yusufa belə demişdi:

**"...Oğlum! Yuxunu qardaşlarına danışma, yoxsa sənə hiylə qurarlar. Həqiqətən, şeytan insanın açıq-aydın düşmənidir"[103].**

Sonra onlar Yusufun öldürülməsi barədə sözləşərək quyuya atılması və onu kafirlərin ölkəsinə gedənlərə sataraq kölə kimi özləri ilə aparmaları məqsədilə ona zülm etmişdilər. Yusuf, zülmə uğradıldıqdan sonra onu əxlaqsızlığa çağıran, zina etmək məqsədilə onu arzulayan və bu barədə özünə köməkçi ola biləcək adamlardan kömək diləyən bir qadınla imtahana çəkilmişdi. Buna baxmayaraq Yusuf özünü qorumuş, əxlaqsızlıqdansa, zindanı, bu dünyadakı əzabı üstün tutmuş, Allahın qəzəbindən qorxmuşdu. Beləliklə də Yusuf, öz nəfsinə uyub pozğun niyyətlə onu sevən bir qadının zülmünə düçar olmuşdu.

Bu sevgi Yusufun başına bir bəla oldu. Qadının şəfa tapması Yusufun onunla razılaşmasındaydı. Ona acığı tutanlar elə qəzəbləndilər ki, hətta azğınlıqlarından onun quyuya atılmasına və sonra da, heç bir üstünlük əldə etmədikləri halda, əsir və kölə edilməsinə səbəb oldu. Bax beləcə, ona acığı tutanlar heç bir üstünlük əldə etmədən onu azadlıq sərbəstliyindən məhrum edib saxta köləliyə saldılar. Bu vəziyyət onu öz razılığı ilə məhbus olmağa vadar etdi. Bu, onun çəkildiyi imtahanın və çətinliyinin ən böyüyü oldu. Həbsxanadakı səbirliliyi, Allahdan qorxmaqla bərabər həm də iradi bir səbirlilikdi. Lakin onların etdiyi amansızlığa qarşı səbr etməsi xeyirxahların səbri idi. Onlar kimi səbr etməyənlərin azması heyvanlar kimi azmışların müsibətinə bənzər.

İkincisi, yəni, həbsxanaya atılmasına baxmayaraq əxlaqsızlığa düşməmək üçün səbr edənin səbri iki səbrin ən üstünüdür.

Buna görə Uca Allah belə buyurur:

**"...Kim *Allahdan* qorxsa və səbir etsə, *bilsin ki,* Allah yaxşı iş görənlərin mükafatını puç etməz"[104].**

Budur, mömin bu tərzdə, imanına görə, əziyyətə məruz qoyularsa, ondan kafir olması, günah işlər görməsi, Allaha qarşı çıxması tələb edildikdə, onları qəbul etmədiyi

---

[101] Bəqərər, 2/109
[102] Yusuf, 12/8
[103] Yusuf, 12/5
[104] Yusuf, 12/90

təqdirdə ona əziyyət və işgəncə verilməsinə, həbs edilməsinə, yaşadığı yerdən sürgün edilməsinə baxmayaraq bu işgəncə və cəzaları dinindən ayrılmaqdan üstün tutarsa, o, Yusufun səbirliliyindən də daha möhkəm səbrə malik olar. Belə ki, bu hal vətənlərindən ayrılmağı dinlərindən ayrılmaqdan üstün tutan mühacirlərin başına gəlmişdir. Onlar işgəncələrə qatlanır və əziyyətə dözürdülər.

Peyğəmbər (s.ə.s.) də bir çox əziyyətlərə məruz qoyulmuşdu və məhz öz üstünlüyü ilə onlara səbr etmişdi.  Əslində o, öz istədiyi edə bilmədiyinə görə əziyyət çəkirdi. Bax bu isə, Yusufun (ə.) səbrindən daha möhkəm səbirlilik idi. Çünki Yusufdan təkcə əxlaqsızlıq etməsi istənilmişdi və o bunu etmədiyi üçün zindana salınmışdı.

Amma Peyğəmbərdən (s.ə.s.) və səhabələrindən (A.o.r.) isə kafir olmaq və bunu yerinə yetirmədikləri təqdirdə öldürüləcəkləri və ağır cəzalara məruz qoyulacaqları hədələnmişdilər. Cəza verilməsinin ən sadəsi həbsdir. Həqiqətən, müşriklər Peyğəmbəri (s.ə.s.) Haşim oğullarının məhəlləsində bir müddət həbs etmişdilər. Daha sonra, Əbu Talibin ölümü ilə əlaqədar başqa üsullara da əl atmışdılar. Ənsarlar *Peyğəmbərə (s.ə.s.)* biət etdikdən sonra müşriklər bunu öyrənib, onun hicrət etməsinə mane olmaq istədilər. Onu (s.ə.s.) və səhabələrini *şəhərdən* çıxmağa qoymurdular. Bu səbəbə görə Ömər (A.o.r.) və onun kimilərini çıxmaq şərti ilə, qalan hamısı gizlicə hicrət etmişdilər.

Buna baxmayaraq onları ölkədən çıxmağa məcbur edənlər də elə müşriklərdi. Bununla belə mane ola bildiklərinə ləngidib həbs etdilər. Nəticə etibari ilə möminlərin məruz qaldıqları əziyyət və müsibətlər, Allaha və Onun Peyğəmbərinə (s.ə.s.) itaət etməyi üstün tutmalarından irəli gəlmişdi.

Müsəlmanların (*hicrətlə bağlı*) başlarına gələn *müsibətlər* Yusufun (ə.) həbs edilməsi kimi, yəni qulun özünün seçimi olmadan başına gələn səmavi müsibət kimi olmamışdır.

*Bu hicrət* Yusufun (ə.) atasından (ə.) ayrılıb getməsi kimi də olmamışdır. Bax bunlar iki hissənin ən şərəfli olanıdır. Bunu edənlər isə ən yüksək dərəcələrə sahib olanlardır.

Buraya qədər kitabın 100-cü səhifəsidir. 35 səhifə qalır ki, onu ayın sonuna qurtarram. Yeni əsər seçin! İşim dayanmasın. Həvəsim sönsə, daha məndən inciməyin ha!.. (Zarafat eləyirəm e...). Təkliflərini ünvanıma göndərə bilərsən. Əvvəlki hissəni poçtundan götürüb baxa bilmisənmi?  F.S.

24.07.07. 02.00

Əslinə qalanda, insan nə qədər müsibətə düçar olursa, səbri və razılığına görə, savab qazanır və çəkdiyi əziyyətlərdən ötrü günahları bağışlanır; onun din uğrunda müsibət çəkməsi və sıxıntı keçirməsi Allaha itaəti üstün tutması ilə səciyyələnir və bu insan çəkdiyi əziyyətlər üçün özünə savab qazanır və buna görə bu adama yaxşı bir əməl yazılır.

Uca Allah belə buyurur:

**"...Çünki Allah yolunda onlara üz verən elə bir susuzluq, yorğunluq və aclıq, kafirləri qəzəbləndirən elə bir atılmış addım, düşmən üzərində qazanılan elə bir uğur yoxdur ki, bunların müqabilində onlara yaxşı bir əməl yazılmasın. Həqiqətən, Allah yaxşı iş görənlərin mükafatını puç etməz"[105].**

Lakin nə xəstəlik, nə əzizlədiyi bir adamın ölümü və nə də var-dövlətinin oğurlanması kimi, qulun, hər hansı bir üstünlüyü nəzərdə tutmadan, başına gələn müsibətlər yuxarıda izah etdiyimizə aid deyildir.

Çünki belə müsibətlərə məruz qalanlar təkcə bu müsibətlərə səbr etdikdə savab qazana bilərlər. Əksinə, ancaq müsibətin gəlməsi və onun əmələ gətirdiyi şeylərdən ötrü savab verilmir.

İmanına görə, Allaha və Onun Elçisinə (s.ə.s.) itaət etdikləri üçün işgəncələrə məruz qoyulanlar və buna görə çətinliklərlə, xəstəliklərlə, həbsə atılmaqla, vətəndən ayrılmaqla, var-dövlətinin və ailəsinin dağılması ilə və küfrlə üzləşənlər, nüfuzunun *itməsi* və malının azalması kimi hallar başına gələn insanlar olmaqla bərabər, onlar bu vəziyyətdə peyğəmbərlərin və onların ardıcılları olan ilk mühacirlərin yolu ilə getdikləri üçün, çəkdikləri bu cəfakeşliyə görə mükafatlandırılırlar. Məhz buna görə onlara yaxşı əməl kimi savab yazılır.

Mücahidin keçirdiyi aclıq, susuzluq, yorğunluq və kafirləri qəzəbləndirməsi kimi, bunlar mücahidin şəxsən yerinə yetirdiyi bilavasitə əməl olmasa da, öz iradəsinə uyğun bir davranış olduğundan mükafatlandırılır.

Bu mövzu ilə əlaqədar olaraq insanlar belə ixtilaf ediblər: Doğrudanmı bu, səbəbinmi və yaxud Allahınmı etdiyi əməldir? Bəlkə bunu törədən yoxdur?

Ən doğrusu, bu işin, səbəbkarı ilə digər səbəblər arasında ortaq bir məxrəcin olmasıdır. Buna görə beləsinə yaxşı əməl yazılır.

Məqsəd aşağıda deyiləndir. Həsəd - qəlb xəstəliklərindəndir və o, insanların, çox azından başqa, xilas ola bilmədikləri geniş yayılmış xəstəlikdir. Buna görə belə deyilir: "Bədən həsədsiz olmaz. Lakin şərəfsiz büruzə verər, şərəfli gizləyər".

Həsən Bəsridən: "Mömin həsəd çəkərmi?" deyə soruşanda: "Ay atasız qalmış! Yusufun qardaşlarını niyə unudmusan? Sən onu qəlbində saxlayaraq, əlinlə və dilinlə onu etmədikcə, sənə zərər verməz" – cavabını vermişdir.

Kim ki, nəfsində bir başqasına qarşı həsəd hiss edərsə, ona lazım olan şey – Allaha itaətini artırmalı, işini səbirlə görməli və belə bir hissin çirkin bir əməl olduğunu düşünməlidir. Dindar insanların bir çoxu həsəd çəkdiklərinə qarşı haqsızlıq etməzlər, ona zülm etməyi də nəzərdə tutmazlar

Amma onlar bununla bərabər həsədini çəkdikləri şəxsin vacib haqlarını yerinə yetirərlər. Hətta, kimsə onu qınasa belə, onlar qınanılmağa əhəmiyyət verməzlər, yaxşılıqlarından da danışmazlar. Eynilə, biri onu təriflədikdə, dinməzlər. Məhz belələri, onun haqqında yerinə yetirməli olduqları hökmləri icra etmədiklərinə görə, bu

---

[105] Tövbə, 9/120

məsələdə həddi aşdıqlarından ötrü deyil, naqis rəftar etdiklərinə görə cəzalandırılacaqlar.

Onların cəzası, həm həsəd çəkdiklərinin haqqını tapdamış olduqlarına və həm də eyni vaxtda özlərini insafsızcasına apardıqlarına görədir. Onlar həsəd apardıqları şəxslərə kömək göstərməmələrinə baxmayaraq, onlara zülm edənlərə də yardım etməmiş olsalar da belə, sözləri və hərəkətləri ilə həddi aşdıqları üçün əzab çəkəcəklər.

Kim ki, Allahdan çəkinib səbr edər və beləliklə zalımların cərgəsinə düşməzsə, Allahdan qorxduğuna görə, Allah da ona xeyir verəcəkdir. Cəhşin qızı Zeynəbin başına gələn əhvalatda olduğu kimi. Həqiqətən də, Zeynəb (A.o.r.) Peyğəmbərin (s.ə.s.) zövcələri arasında Aişə (A.o.r.) ilə birincilik barədə bəhsə girmişdi. Qadınların bir birinə həsəd çəkmələri, xüsusilə bir ərin arvadları arasında geniş yayılmışdır. Doğrudan da, qadın ərindən ona düşəcək qismətə görə, ərini qısqanır.

Əslində, ər də, şəriklilik üzündən arvadlarının bəzi haqlarını yerinə yetirə bilmir. Bax bu hallara aid olan həsəd, o cümlədən, başçılıq etmək istəyənlər və mal-mülkdə şərik olanlar arasında çox baş verir. Xüsusilə, biri ona çatacaq payı aldığı halda, o birisinin ala bilməməyi buna səbəb olur. *Bu hal* bərabər olanlar arasında da əmələ gəlir. Yusuf və qardaşları arasında olduğu kimi. Onlardan bir o birisinin özündən üstün olmasından xoşlanmadığından ötrü ona həsəd aparır. Adəm əleyhissalamın iki oğlu arasında eyni olan oxşarlar arasında birinin digərinə həsəd çəkməsi də həmin qəbildəndir.

Qardaşın qardaşa həsəd çəkməsi, Allahın bir qardaşın qurbanını qəbul edib, o biri qardaşın qurbanını qəbul etməmsi nəticəsində baş vermişdi. Beləliklə, o, Allahın, qardaşının qurbanını qəbul edib, onun qurbanını qəbul etməmsilə, imanı və təqvası müqabilində qardaşını ondan üstün tutduğu üçün, qardaşına həsəd çəkdiyinə görə onu öldürmüşdü. Buna oxşar bir nümunə də yəhudilərin müsəlmanlara həsəd aparmasıdır.

Buna görə belə deyilmişdir: Allaha qarşı törədilən ilk günahlar üçdür. Hərislik, təkəbbür və həsəd. Hərislik Adəm əleyhissalam tərəfindən, təkəbbür İblis tərəfindən, həsəd isə, qardaşı Habili öldürən Qabil tərəfindən törədilmişdir. Hədisdə belə rəvayət edilir:

***"Üç şeydən heç kim xilas ola bilməz. Bunlar həsəd, zənn və uğursuzluqdur. Sizə bunlardan çıxış yolunu deyim: həsəd çəkdikdə nifrət etmə, zənnə qapıldıqda araşdırma və uğursuz saydığın işi davam etdir".*** Bu hədisi Əbu Hüreyrədən (A.o.r.) İbn Əbud-Dünya rəvayət etmişdir[106].

Sünəndə Peyğəmbərdən (s.ə.s.) belə bir hədis rəvayət edilir:

***"Daxilinizdə sizdən əvvəlki millətlərin xəstəliyi olan həsəd və nifrət oyanmışdır. O sizi qırxacaqdır*. Mən başınızı qırmaqdan danışmıram. Ancaq sizin dininizi rəndələyəcəkdir"[107].***

---

[106] Kənzul-Ummal, 43789

* Təraş etmək sözü məcazi olaraq "başı qal etmək", "başı aldatmaq" mənaları verir. F.S.

[107] Tirmizi, hədis N 2510; Əhməd, 1/165, 167

Peyğəmbər (s.ə.s.) xəsisliyi xəstəlik adlandırdığı kimi, buna da xəstəlik demişdir. Aşağıdakı hədisdə olduğu kimi:

***"Təstəlikdən daha pis hansı xəstəlik vardır?"[108]***

Elə isə, bu bir xəstəlikdir. Başqa bir hədisdə isə deyilir:

***"Xülyaların, istəklərin və xəstəliklərin pisliklərindən Sənə sığınıram"[109].***

Bu hədisdə xəstəliklər sözü xülyalara və istəklərə aid edilmişdir. Əsil həqiqətdə də, əxlaq nəfsə xas olan adətlərlə səciyyələnir. Uca Allah buyurur:

**"Həqiqətən də sən böyük əxlaq sahibisən!"[110]**

İbn Abbas, İbn Uyeynə və Əhməd b. Hənbəl (Allah onlardan razı olsun) ayənin mənası barədə: "Sən böyük bir din sahibisən" ifadəsini işlətmişlər. İbn Abbasın (A.o.r.) ifadəsi: "İslam dininin sahibisən" kimidir. Aişə (A.o.r.) də: "Onun əxlaqı Quran idi"[111] demişdir. Həsən Bəsri (A.o.r.) isə belə deyib: "Ən yüksək əxlaq – Quran ədəbidir".

**Həvəs**

Həvəs, bəzən tez ötüb keçən narahatçılığa bənzəyir. Narahatlıq – xəstəlik deməkdir. Bu isə, qəlbin ağrı hiss etməsi və onda hər hansı bir şeyin pozulmasıdır.

Birinci hədisdə həsəd ilə kin (nifrət) bir yerdə yad edilmişdir. Çünki həsəd çəkən, hər şeydən əvvəl, Allahın başqasını *ondan* üstün tutmasını bəyənməz və sonra da həmin adama nifrət bəsləməyə başlayar.

Hər hansı bir şeyə nifrət etmək, sonrakı gözü götürməzliyi zəruriləşdirir. Belə ki, Allahın neməti həsədtörədici ünsür olduqda, həsəd çəkən isə o nemətin yox olmasını istədikdə, onu gözü götürməz və onun yoxa çıxmasını arzulayar.

Həsəd – qısqanclığı və həddi aşmanı vacib edir. Belə ki, Allah bizdən əvvəlkilərin ixtilafları barədə bizə xəbər verərək, belə buyurur:

**"...Kitab verilənlər ancaq özlərinə elm gəldikdən sonra aralarındakı zülm və həsəd üzündən ixtilafa düşdülər..."[112].**

Əlbəttə ki, onların ziddiyyətə düşməsi elmsizliklərindən deyildi. Əksinə, onlar həqiqəti bilirdilər; lakin onların bəziləri, həsəd çəkənlərin bir-birilərinə həsəd çəkdiyi kimi, qısqandılar və zülm etdilər.

"Səhihlər" - də Ənəs b. Malikdən (A.o.r.) belə bir rəvayət edilir:

***"Bir-birinizə həsəd çəkməyin, kin saxlamayın, arxa çevirməyin və əlaqələrinizi kəsməyin. Ey Allahın qulları, qardaş olun! Bir müsəlmanın din qardaşını üç gündən***

---

[108] Buxari, hədis N 3137
[109] Tirmizi, hədis N 3591
[110] Qələm, 68/4
[111] Müslim, hədis N 746
[112] Ali-İmran, 3/19

***artıq tərk etməsi halal deyil. İki müsəlman qarşılaşarkən biri bu yana, digəri o yana gedənlərdən ən xeyirli olanı salamı birinci verəndir"*[113]**.

Ənəsdən (A.o.r.) bir başqa hədis:

***"Canım əlində Olana and olsun ki, sizdən biri özü üçün istədiyini qardaşı üçün də istəmədikcə, iman gətirməz"*[114]**.

Uca Allah belə buyurur:

**"İçərinizdə eələri də var ki, *cihada çıxdıqda özlərini* yubandırar və sizə bir müsibət üz vermiş olduqda: "Allah mənə mərhəmət göstərdi ki, mən onlarla birlikdə *bəlaya düçar* olmadım" – deyər. Əgər Allahdan sizə bir lütf yetişərsə, onda guya sizinlə onun arasında heç vaxt bağlılıq olmamış kimi: "Kaş mən də onlarla birlikdə olub böyük bir uğur qazanaydım!" – deyər"[115].**

Bax, beləcə öz yerindən tərpənmək istəməyənlər özləri üçün istədiklərini, qardaşları üçün arzulamırlar. Əksinə, əgər onlara bir bədbəxtlik üz verdikdə, "yaxşı ki, ancaq onların başına gəldi", deyə düşünərək sevinirlər, amma onlara nemət verildikdə sevinmir, ondan özlərinə pay umurlar.

Beləliklə, onlar ancaq özlərinə nəsib olmuş dünya malı üçün və yaxud maddi bir zərərdən xilas olduqlarına görə sevinirlər. Çünki onlar Allahı, Onun Elçisini (s.ə.s.) və Axirət yurdunu sevmirlər. Əgər belə olmasaydı, onlar qardaşlarını sevər və başlarına gələn bədbəxtlikdən əzab çəkər və nemətə görə sevinərdilər. Kim ki, müsəlmanlara sevinc gətirən bir şeyə sevinməzsə, onları kədərləndirən bir şeyə kədərlənməzsə, o onlardan deyildir.

"Səhih"-də Əmir əş-Şabidən belə bir rəvayət verilmişdir:

**"Numan b. Bişri xütbədə belə deyərkən eşitdim: "Allahın Elçisi** (s.ə.s.) **belə deyərkən eşitdim: *"Möminlər bir-birini sevməkdə, bir-birilərinin halına yanmaqda və bir-birilərini müdafiə etməkdə bir bədənə bənzərlər. Bədənin bir üzvü xəstələndikdə digər üzvləri də bu səbəbdən yuxusuzluğa və qızdırmaya tutulurlar"*[116].**

"Səhiheyn"-də Əbu Musa əl-Əşari (A.o.r.) Allahın Elçisinin (s.ə.s.) belə dediyini söyləyir:

***"Möminin möminə olan münasibəti biri digərinə möhkəm pərçimlənən kərpic kimidir"*.** Peyğəmbər (s.ə.s.) bu fikrini aydınlaşdırmaq üçün iki əlinin barmaqlarını bir-birinin arasına keçirdib bağladı[117].

**Xəsislik**

"Simiclik"*[118] bir xəstəlikdir, xəsislik də. Həsəd isə xəsislikdən pis xəstəlikdir.

---

[113] Buxari, hədis N 6065; Müslim, hədis N 2559
[114] Buxari, İman, 13; Müslim, hədis N 45
[115] Nisa, 4/72-73
[116] Buxari, hədis N 6011; Müslim, hədis N 45
[117] Buxari, hədis N 2446; Müslim, hədis N 2585
* Türk mətnində "Şuh" sözü yazılmışdır. F.S.

Əbu Davud isə Peyğəmbərin (s.ə.s.) belə dediyini rəvayət edir:

***"Həsəd də, odun odunu yeməsi kimi, yaxşılıqları yeyir. Sədəqə isə, suyun odu söndürməsi kimi, xətaları keçirir"**[119].***

Buna səbəb aşağıdakıdır: Xəsis özündən əsirgəyər, həsəd aparan isə Allahın qullarına verdiyi neməti bəyənməz. Bəzən insan ona müəyyən niyyətlə kömək göstərən bir adama *nə isə* verə bilər; ona oxşayan digərlərinə isə həsəd çəkə bilər. Bəzən də, insan başqasına həsəd çəkmədən xəsis ola bilər. "Şuh" (*simiclik*) isə bunların bünövrəsi, özülüdür. Uca Allah belə buyurur:

**"...Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır"[120].**

"Səhiheyn"-də Peyğəmbərin (s.ə.s.) belə dediyi rəvayət edilir:

***"Simiclikdən çəkinin, çünki o, sizdən əvvəlkiləri məhv etmişdir. Onlara simicliyi əmr etdi – onlar da simicləşdilər, zülmü əmr etdi – zalımlıq etdilər; əlaqələri kəsməyi əmr etdi - əlaqələri kəsdilər"[121].***

Abdurrahman b. Auf təvaf edəndə bu duanı çox edərdi: "Allahım! Məni nəfsimin tamahından qoru!"

Bir nəfər ona: "Nə üçün sən bu duanı belə çox təkrarlayırsan?" – deyə soruşduqda, belə cavab vermişdi: "Nəfsimin tamahından qorunsam, xəsislikdən, zalımlıqdan və əlaqələri kəsməkdən də qorunaram". Həsəd – zalımlığı tələb edir.

---

*[118] Xəttabi şuhu belə izah edir: "Şuh, xəsislik sözünün mənasındakı verməməkdən daha artıqdır. Şuh, əsas *məfhumu ifadə edən* isim, xəsislik isə onun bir növü, xassəsi hesabındadır. Xəsislik ayrı-ayrı xüsusi hallara aid edildiyi halda, şuh (simiclik) daha ümumi və geniş məna daşıyır. **Şüh öz təbiəti və səciyyəsi baxımından insanın ayrılmaz bir halıdır.** Şuh, həm mal verməkdə, həm də yaxşılıq etməkdə xəsislik, simiclikdir. Xəsislik isə ancaq bir şey verməklə bağlı simiclikdir. Bax: Avnul Məbud, c. 3, s. 79. (Tərc. qeydi: *Qalın şriftlə verdiyim müəllif fikri* (**Şüh öz təbiəti...**), *zənnimcə, birmənalı və ziddiyyətsiz deyil*. F.S.).

** Keçirmək – söndürmək mənasında işlədilmişdir. Məs.: "işığı keçirmək", yəni, söndürmək. F.S.

[119] Əbu Davud, 4903

[120] Həşr, 59/9

[121] Əbu Davud, 1698; Nəsai, 603; Əhməd, 2/159

# ŞƏHVƏT VƏ EŞQ XƏSTƏLİYİ

Xəsislik və həsəd insana fayda verən şeylərə nifrət bəsləməsini və əksinə, onun zərərinə olanları şeyləri sevməsini zəruriləşdirən xəstəliklərdir. Buna görə, həsəd, kin və qəzəb həmişə bir yerdə olur.

Şəhvət və eşq xəstəliyi isə insanın özünə zərər verən şeyləri sevməsidir. Bəzən bunlarla yanaşı insana fayda verə bilən şeylərə qəzəblənməsi də burada təsir göstərə bilər.

Eşq – psixi və nəfslə bağlı bir xəstəlikdir. Bədəndə təsiri artdıqca orqanizmdə bu xəstəliklər əmələ gəlir. Bu, ya beyin xəstəliklərindən olan malxulya kimi bir patologiyadır. Məhz buna görə, eşq mərəzi qarasevdaya oxşar təqibedici ideya, şəkk-şübhə və vəsvəsə doğuran bir xəstəlikdir deyilmişdir. Yaxud da can xəstəliklərindən olan zəiflik, gücsüzlük və əhvalsızlıqdan və bunlara bənzər çatışmazlıqlardan törəyir. Burada əsas məsələ - qəlbin xəstələnməsidir. Çünki o, insan nəfsinin özünə zərər verən şeyi sevməsinin əsasıdır. O, eynilə özünə zərər verən şeyləri arzulayan bədən xəstəliyidir. Belə xəstə həmin arzuya çatmasa, əzab çəkəcək, əgər arzusuna çatsa da, yenə xəstəliyi artıb ağırlaşacaq.

Aşiq də belə bir vəziyyətdədir. Sevgilisi ilə görüşü, onun səsini eşitməsi və ona təmasla yaranan münasibətlər özünə zərər verir. O hətta sevgilisini arzuladığı, düşündüyü və xəyalında canlandırması hallarında da bundan ziyan çəkir.

Bu istəklərindən uzaqlaşdırıldıqda isə *qəlbi* ağrıyır, əzab çəkir. Əgər arzuladığı ona verilərsə, xəstəliyi daha da şiddətlənir və ağrı-acılarının artmasına səbəb olur. Bir hədisdə belə deyilir:

***"Allah mömin qulunu bu dünyadan, siz xəstənizi yemək-içməkdən uzaq saxladığınız kimi, uzaq saxlayar"*[122].**

Əhmədin "Zühd" kitabında Vəhbdən Musa əleyhissalamın münacaatı ilə bağlı belə bir rəvayət nəql edilir:

***"Uca Allah buyurur ki, Mən həqiqətən dostlarımı, şəfqətli bir çobanın dəvələrini zərərli otlaqlardan uzaqlaşdırdığı kimi, bu dünyadan uzaqlaşdırıram və bir də, çobanın dəvələrini təhlükəli yerlərdən çəkib apardığı kimi, çəkib aparıram. Bu, onların Mənim dərgahımda dəyərsiz olmalarına görə deyildir. Lakin Mən bunu – dərgahımda onlara nəsib olacaq kəraməti möhkəm və bütövlükdə tamamlamaq və bu dünya onları yaralamamış, istəkləri onları soyutmamış, onlara vermək üçün edirəm"*[123].**

Xəstənin sağalması, xəstəliyin yox olması ilə - bilavasitə bu pis sevginin qəlbindən büsbütün çıxması ilə baş verir.

İnsanların eşq haqqındakı dedikləri iki hissədən ibarətdir. Bəziləri deyir ki, "Bu, iradəyə aid bir mövzudur". Yaxşı məlum olan nəzər nöqtəsi də elə budur. Başqaları isə deyirlər ki, bu "təsvirlərlə bağlı bir məsələdir", eşq xəyalpərəstlikdən qidalanan bir pozuqluqdur.

Belə ki, aşiq məşuqunu olduğu vəziyyətdən fərli halda təsəvvür edir. Onlar deyirlər ki: "Məhz buna görədir ki, Allah eşq ilə vəsf edilmir və O, vəsf edilməz, O,

---

[122] Əhməd, 5/428; Tirmizi, hədis N 2036
[123] Əhməd, "Zühd", hədis N 341

bundan uzaqdır, pakdır. Pozulmuş düşüncəsi ilə Onun haqqında xəyala dalan Ona həmd edə bilməz.

Bir sıra başqaları isə belə deyirlər: “Allah eşqlə vəsf edilə bilər. Çünki eşq tam bir sevgidir. Allah isə həm sevir, həm də sevilir”.

Abdulvahid b. Zeyd bir hədisdə Uca Allahın belə buyurduğunu rəvayət edir: “Qulum Mənim ona, onun Mənə olan eşqi ilə Mənə yaxınlaşmaya davam edir”.

Çoxluğun yekdil olduğu rəy belədir ki, eşq sözünü Allah barədə işlətmək olmaz. Çünki eşq yaraşmayan, həddi aşan, artıq bir şeydir. Allahın sevgisi sonu olmayan, həddini aşmaq mümkün olmayan bir sevgidir.

Onlar deyirlər ki: “Eşq qəti şəkildə pislənmişdir. Nə Yaradanın sevgisində, nə də məxlqatının sevgisində təriflənməz. Çünki o sərhədləri məlum olan səviyyəni aşan ifrat sevgidir”.

Eyni formada eşq sözü, bir qayda olaraq, insanın qadını və övladını sevməsində istifadə edilir. Ailəyə, var-dövlətə, vəzifəyə, mövqeyə, peyğəmbərlərə və əməlisalehlərə bəslənən sevgidə işlədilməyən bir sözdür.

Eşq ümumiyyətlə haram olan bir əməllə bərabər dayanır. Bu ya əcnəbi qadına olan sevgidir, ya da oğlana olan sevgidir. Bununla bərabər haram baxış, haram təmas və yaxud da buna oxşar digər haram hərəkətlər də vardır.

İnsanın öz arvadını və ya cariyəsini ədalətsizcəsinə sevməsində ümumi olan da budur. Ona görə də halal olmayanı edir, sevdiyini isə qoyub gedir. Hətta yeni evləndiyi arvadına görə, köhnə arvaddan olan uşağına da zülm edir və yenə, onun istəyini yerinə yetirmək üçün dininə və dünyasına zərər verən şeyləri həyata keçirir.

Məsələn, haqqı olmayan əmlakı *təzə arvada* verir və yaxud sevdiyi xanımına verdiyi səlahiyyətdə mal-mülkdə Allahın qoyduğu hüdudları aşır. Ona çəkdiyi xərclərdə israfçılığa yol verir və ya da dininə, dünyasına zərər verən şeyləri etməsinə imkan yaradır. Məhz bu, birlikdə olması halal sayılana bəslədiyi eşqdir.

Belə olduğu halda, bəs onda əcnəbi bir qadına və ya oğlana duyduğu eşqdən ötrü nələri etməz? Bu haldakı günahkarlığın hüdudlarını ancaq aləmlərin Rəbbi olan Allah bilir. Baxın, eşq elə bir xəstəlikdir ki, aşiqin dinini və namusunu puç edər. Sonra isə, növbə ilə, ağlını və canını məhv edər.

Uca Allah buyurur:

**“...Əgər Allahdan qorxursunuzsa, *yad kişilərlə* nazlana-nazlana danışmayın, yoxsa qəlbində xəstəlik olan tamaha düşər...”[124].**

Qəlbində şəhvət xəstəliyi olan şəxsin arzuladığı qadın onunla nazla danışdıqda bu xəstəlik onda baş qaldırar. Tamah (güclü istək) iradəni və nəfsi qüvvətləndirir və beləliklə, xəstəlik də artır.

Lakin arzuladığı adama ümid etməyən kəs belə deyil. Çünki ümidsizlik arzunu yoxa çıxarır və bu minvalla iradə zəifləyir, ardıyca da sevgi öləziyir. İnsan iradəsinə uyğundur və arzuladığı bir əməlin olmamsını qətiyyən qəbul etməz. Əksinə öz-özünə danışar. Sonra buna danışıq, baxış və bunlara oxşar şeylər əlavə olunur.

Lakin eşqə mübtəla olub özünü namusla aparan, səbr edən şəxs, Allahdan qorxduğuna görə mükafatlandırılır. Bir hədisdə belə rəvayət edilir: ***“Kim aşiq olduqdan sonra ismətlə dolanıb eşqini gizlədərək səbr edərsə və sonra da ölərsə, şəhid sayılar”[125].***

---

[124] Əhzab, 33/32

Yəhya b. Kuttat bu hədisi Mücahiddən, o da İbn Abbasdan (A.o.r.) mərfu* kimi rəvayət etmişsə də, bu qəti deyildir. Belə hədis dəlil kimi istifadə olunmur.

Amma şəriət dəlillərindən məlum olduğuna görə, baxış, söz və hərəkət kimi haramlar müqabilində ismətini qoruyub, eşqini gizlədərək, ondan hər hansı bir qula* şikayət etməzsə, bu günahını kiməsə bildirməzsə və məşuqundan haram bir şey istəməklə bağlı araya bir söz çıxmasına yol verməyib onu gizlədərsə və başına gələn digər bədbəxtliklərə səbr etdiyi kimi, qəlbindəki eşq ağrısına, Allaha asi çıxmamaqla dözərsə, bax onda o, Allahdan çəkinən və səbr edənlərdən sayılar. Bu barədə Uca Allah belə buyurur:

**"...Kim *Allahdan* qorxsa və səbir etsə, *bilsin ki,* Allah yaxşı iş görənlərin mükafatın puç etməz"[126].**

Nəfs xəstəliklərindən olan həsəd və digər qəlb azarlarında da vəziyyət eynilə səciyyələnir. Nəfs, Allahın qəzəbi tutduğu şeyləri tələb etdikdə, insan, Allahın qorxusundan onlardan çəkinərsə, o, Allahın aşağıdakı vədinə ümid edə bilərlər:

**"Ancaq kim Rəbbinin hüzuruna gələcəyindən qorxmuş və nəfsinə ehtirası yasaq etmişsə, həqiqətən, Cənnət onun məskəni olacaq"[127].**

İnsan bir şeyi istəyərkən əldə edilməsi mümkün olan şeylərə nail olmağa çalışır. Hətta bu arzu ilə bağlı olan bir çox şeyləri də əldə etməyə səy göstərir. Kim ki, qınanan bir üsulla sevər və pislənən bir tərzdə nifrət edərsə və ona müvafiq hərəkət edərsə, günahkar olar.

Deyək ki, bir nəfər bir şəxsə həsəd çəkdiyinə görə qəzəblənir və ona aid olan məsələlərdə onu incidir. Belə ki, haqqını vermir, düşmənçilik edir, onu məhz öz maraqları xatirinə sevdiyi üçün haram bir iş görməklə və yaxud Allah naminə etməli olduğu bir əməli Onun üçün deyil, öz şəxsi istəyinə görə yerinə yetirməklə günah edir.

Bax bunlar nəfsə aid bir sıra xəstəliklərdir. İnsan bəzən bir şeyə görə qəzəblənəndə, əsəbiləşməsi üzündən əsassız qorxu hissi ilə çox şeylər haqqında düşünür. Belə ki, onların şairlərindən biri belə demişdir:

Onu sevdiyimə görə
Sudanı da sevirəm.
Hətta onu sevdiyimə görə,
Qara iti də sevirəm.

Göründüyü kimi, qara dərili bir qadını sevən adam qara rəngdə olan nə varsa, o, hətta it olsa belə, onu sevir. Əslində, bütün bunlar qəlbin iradəsində və xəyalındakı xəstəliklərdir. Allahdan, bizi qəlbimizdə olan bütün xəstəliklərdən qorumasını diləyirik. Əxlaqımızda, istəklərimizdə olan pis xəstəliklərdən Allaha sığınırıq!

**Qəlb** ancaq **Allahı sevmək üçün** yaradılmışdır. O, Allahın qullarına verdiyi bir fitri təbiətdir*. Bununla əlaqədar İslam Peyğəmbəri (s.ə.s.) belə demişdir:

---

[125] İraki, "İhya"-nın hədislərinin ravilərinin üzə çıxarılmasında 3/113 və Hakim "Tarix"ində İbn Abbasdan rəvayət etmişdir.

* **Mərfu -** Peyğəmbərin (s.ə.s.) olan bütün sözləri, əməlləri və təqdir etdiyi şeyləri bildirən hədis terminidir. F.S.

* Burada: Allahın qulu, bəndəsi nəzərdə tutulur. F.S.

[126] Yusuf, 12/90

[127] Naziat, 40-41

***"Hər doğulan öz təbiəti ilə doğulur. Ata-anası onu ya yəhudi, ya xristian və ya da atəşpərəst edir. Bu, eynilə bir heyvanın əli və ayağı ilə birlikdə normal doğulması kimidir. Siz onlarda hər hansı bir çatışmazlıq görürsünüzmü?"*** Əbu Hureyrə (A.o.r.) *bunu rəvayət etdikdən* sonra dedi: İstəsəniz bu ayəni[128] oxuyun:

**"Sən bir hənif kimi üzünü dinə tərəf çevir. Allahın insanlara – xəlq etdiyi *şüurlu* məxluq kimi verdiyi fitrət budur. Allahın yaratdığını heç cür dəyişdirmək olmaz..."[129].**

Allah insanları təkcə Ona ibadət etmək və Onu sevmək üçün yaratmışdır. Belə olduqda, fitrət* pozulmayaraq qalarsa, qəlb yalnız Allahı tanıyıb sevəcəkdir. Lakin ata-ananın *övladını* yəhudiləşdirməsi və ya xristianlaşdırması fitrəti pozur. Bütün bunlar Allahın qəza və qədəri ilə olsa da, Allahın yaratdığı insan təbiətini (*valideynin və sairlərinin*) dəyişdirməsi deməkdir.

Deməli, bədənin bir hissəsini kəsib atmaqla, o necə dəyişirsə, fitrət də belə dəyişir. Sonra isə, öz fitri təbiətlərinə qayıtmaq üçün səy göstərənlər, Allahın bunu asanlaşdırması ilə, yenidən fitrətə qayıda bilərlər.

Peyğəmbərlər (onlara Allahın salavatı və salamı olsun) fitrəti dəyişmək və ondan ondan döndərmək üçün deyil, əksinə onu təsdiq edərək kamilləşdirmək üçün göndərilmişdilər. Əgər qəlb təkcə Allahı sevərək, dini yalnız Ona məxsus qılarsa, eşqə aludə olması ilə bağlı ona toxunmayan, çünki bu halda, o heç vaxt  başqasını Onu sevdiyi qədər sevməz!

Qəlbin eşqə düşməsi, onun Allaha olan məhəbbətinin qüsurlu olmasındadır. Buna görə də, Yusuf əleyhissalam Allahı sevərək, dini Ona məxsus qıldığı üçün eşq xəstəliyinə mübtəla olmamışdı.

Uca Allah buyurur:

**"*Qadın* ona meyl etmişdi. Əgər *Yusuf* Rəbbinin dəlilini görməsəydi, o da ona meyl edərdi. Beləcə, Biz pisliyi və çirkin əməli ondan uzaqlaşdırdıq. Həqiqətən, o Bizim seçilmiş qullarımızdandır"[130].**

Yüksək vəzifə sahibinin arvadı imansız idi və buna görə də eşqə giriftar olmuşdu. Allahın Tək olmasına iman gətirməyəndən başqası eşqə düşməz. Çünki Allaha doğru yönəlmiş və Ondan qorxan bir qəlbdə onu eşqə düşməkdən saxlayan iki maneə vardır. Bunlardan biri – Allaha doğru yönəlməsi və Onu sevməsidir. Çünki bu, hər şeyin üstün həzz mənbəyi və yaxşısıdır. Qəlbdə Allaha olan sevgi ilə birlikdə, Onunla ayaqlaşa bilən bir məxluqun sevgisi ola bilməz. Qəlbi eşqə düşməkdən saxlayan maneələrdən ikincisi isə Allah qorxusudur. Eşqin ziddinə olan qorxu, onu həm də uzaqlaşdırır.

Əgər qul Allahı hamıdan daha çox sevirsə və hər şeydən daha çox Ondan qorxursa, onun, gözlənilməz hallarda və yaxud sevgisi və qorxusunun (bir sıra vacib vəzifələri tərk etməsi, bəzi haramları işləməsi halları istisna edilməklə) zəifləməsi anlarında belə, o adamda Allah ***sevgisi və qorxusu ilə*** bərabər nə eşq və nə də ***onlarla***

---

* Yəni, Allahın, insanın ayrılmaz təbii bir xassəsi kimi yaratdığı zəruri bir keyfiyyətdir ki, bəşər əxlaqının başlanğıcı onunla bağlıdır. F.S.
[128] Buxari, hədis N 1358; Müslim, hədis N 2658
[129] Rum, 30/30
* Fitrət – insanın anadangəlmə təbiəti. F.S.
[130] Yusuf, 12/24

***rəqabət apara bilən*** hər hansı bir hiss, duyğu yarana bilməz. Çünki iman itaətlə artır, itaətdən çıxmaqla azalır. Qul istənilən vaxt Allah sevgisi və qorxusu ilə Allaha itaət halında günahlarını tərk edirsə, Allaha bəslədiyi sevgisi və qorxusu qüvvətlənir. Beləliklə, qəlbdə Allahdan başqasına yönəlmiş sevgi və qorxu yox olur.

Cismani, bədən xəstəlikləri də eynilə belə olur. Həqiqətdə sağlamlıq özünə bənzəri ilə qorunur, xəstəlik özünün ziddi ilə sağaldılır. Belə olduqda, qəlbin sağlamlığı imanladır və ona oxşar olanlarla mühafizə olunur. Bu gerçəklik – faydalı elm və xeyirxah əməldir ki, qəlbdə imanın yaranmasını təmin edir. Faydalı elm və xeyirli əməl qəlbin qidalarıdır.

Beləliklə, yüksək etibarlılıqla Peyğəmbərdən (s.ə.s.) rəvayət edilən İbn Məsudun (A.o.r.) hədisində belə deyilir:

***"Ziyafət verən hər kəs, (dəvət olunanların) ziyafət yeməyinə gəlməsini istəyər. Allahın ziyafəti isə Qurandır"[131]*. Quran Allahın qullarına ziyafətidir...[132].**

Gecənin sonu, əzan və iqamə vaxtı, səcdədə və namazlardan sonra... Bunlara bağışlanma əlavə edər. Çünki kim Allahdan bağışlanma istəyərsə və sonra da Ona doğru qayıdarsa, (*Allah*) onu müəyyən olunmuş müddətə qədər layiqincə yaşadar. Qoy belə bir insan gecə və gündüz vaxtlarında Allahı xatırlasın və qarşısına çıxan maneələrə və qarşısını alanlara səbr etsin.

Çünki çox çəkməz ki, Allah ona Öz tərəfindən göndərəcəyi bir mələklə kömək göstərər, imanı qəlbinə yazar. Namazın açıq və gizli fərzlərini beş vaxt mükəmməl surətdə yerinə yetirməyə ciddi-cəhdlə səy göstər, çünki namaz dinin dirəyidir. Həmişə işlətdiyin söz "Lə haulə və lə kuvvətə illə billəh" olsun! Bil ki, yüklər ancaq bununla daşınacaqdır, çətinliklərə ancaq bununla qarşı durmaq mümkündür və yüksək dərəcələrə ancaq bununla çatmaq olur. Allahdan istəməkdən və Ona dua etməkdən usanma!

Çünki qul: "dua etdim, dua etdim, lakin onlara cavab verilmədi" deyərək tələsiklik etmədikcə onun duaları qəbul olunur. Bil ki, qələbə səbirlə, qurtuluş sıxıntılarla və asanlıq da çətinliklərlə bərabərdir[133]. İstər peyğəmbər, istərsə də ondan aşağı pillədə dayananlar olsun, xeyrə ən axırda səbr etməklə yetişmişlər.

Həmd aləmlərin Rəbbi Allaha məxsusdur! İslama və Sünnəyə görə həmd Onadır! Elə bir həm ki, o Onun aşkar və gizli olan bütün nemətlərinə uyğun və Öz səxavətinə şəninin ucalığına yaraşır. Allahın salavatı və salamı Onun Elçisi Muhəmmədə, ailəsinə, səhabələrinə, möminlərin anaları olan zövcələrinə və xeyirxahlıqda onların ardıyca gedənlərə olsun! Ona tükənməz salamlar olsun!

Tərcüməni bitirdim:
30.07.07. 00:38 Fərahim Sələfi

Tərcüməcinin önsözü tamamlanmamışdır. F.S.

---

[131] Darimi, "Fədailil-Quran", 2/433
[132] Tərcümə üçün əsas götürdüyümüz kitabda bu bölüm silinmişdir. Yeri gəlmişkən, diqqət edildikdə, burada mövzu dəyişir. Türk tərcüməçi Alim Yücerin qeydi.
[133] Yəni, onların sayəsində əldə edilir. F.S.